ASAR YAYINLARI

İTHAF OLUNUR:

Əhli Sünnə həqiqi alimlərinə, mücahidlərinə… Dağ kimi elmləri ilə və sarsılmaz metod və səbirləri ilə küfrə, zülmə, fısqa və hər cür bidətə səpər çəkənlərə və o, müqəddəs əmanəti hər nə bahasına olursa-olsun daşıyacaq gələcək nəsillərə…

# NAMAZI TƏRK EDƏNİN (QILMAYANIN) HÖKMÜ

MUHƏMMƏD NƏSRƏDDİN Əl-ALBANİ

www.islamevi.az

TƏRCÜMƏ:
MUSTAFA YİGİT
YAYINA HAZIRLAYAN:
ÖMƏR ƏBU XALİD

**RƏHİMLİ VƏ MƏRHƏMƏTLİ OLAN ALLAHIN ADI İLƏ**

**«Ey Rəbbimiz! Bizi doğru yola yönəltdikdən sonra ürəklərimizə şəkk-şübhə** (azğınlıq, əyrilik) **salma! Bizə Öz tərəfindən bir mərhəmət bəxş et, çünki Sən, doğurdan da, bəxşiş verənsən!»** (Ali İmran 8).

**«Ey Rəbbimiz! Unutduqda və ya yanıldıqda bizi cəzalandırma! Ey Rəbbimiz! Bizdən əvvəlkiləri yüklədiyin kimi, bizi ağır yükləmə! Ey Rəbbimiz! Gücümüz çatmayan şeyi bizə yükləyib daşıtdırma! Bizi əfv edib bağışla, bizə rəhm et! Sən bizim ixtiyar sahibimizsən. Kafirlərə qələbə çalmaqda bizə kömək et!»** (əl-Bəqərə 286).

Allahım! Bütün əməllərimin saleh əməl olmasını və bunları heç kimsə üçün deyil, sadəcə sənin rizan üçün olmasını diləyirəm.

Allahım! Bu kitabı yazan üçün, tərcümə edən üçün, oxuyan üçün, dinləyən üçün, yayan üçün və bu kitabın üzərində əziyyəti olan hər bir kəs üçün xeyirli et! Amin!

**TÜRK DİLİNDƏN TƏRCÜMƏ EDƏN:**

**RƏŞAD RƏHİMLİ**

**REDAKTƏ EDƏN:**

**K. HÜSEYN**

بسم الله الرحمن الرحيم

إنَّ الحمدَ لله ، نحمدُهُ ونستعينُهُ ونستغفرُهُ ، ونعوذُ بالله من شرورِ أنفسنا ، ومن سيئات أعمالنا ، من يهدِهِ اللهُ فلا مضلَّ له ، ومن يُضلل فلا هاديَ لَهُ ، وأشهدُ أنْ لاَ إلهَ إلاَّ اللهُ وحدَهُ لاَ شريكَ لَهُ ، وأشهدُ أنَّ محمداً عبدُهُ ورسولُهُ.

﴿ يا أيُّها الَّذينَ آمنُوا اتَّقُوا اللهَ حقَّ تُقاتِهِ ولاَ تَموتُنَّ إلاَّ وأنتُم مُسلمون ﴾(1).

﴿ يا أيُّها النَّاسُ اتَّقُوا ربَّكُمُ الَّذي خلَقَكُم مِّن نفسٍ واحدةٍ وخلَقَ مِنها زوجَها وبثَّ منهُما رجالاً كثيراً ونساءً واتَّقُوا اللهَ الَّذي تساءلُونَ بهِ والأرحامَ إنَّ اللهَ كانَ عليكُم رقيباً ﴾(2).

﴿ يا أيُّها الَّذينَ آمنُوا اتَّقُوا اللهَ وقُولُوا قولاً سديداً ، يُصلِحْ لكُمْ أعمالَكُمْ ويغفِرْ لكُمْ ذُنُوبكُم ومن يُطعِ اللهَ ورسُولَهُ فقدْ فازَ فوزاً عظيماً ﴾(3)

أما بعد : فإنَّ أصدقَ الحديثِ كلامُ اللهِ ، وخيرَ الهدي هديُ محمَّدٍ – صلى الله عليه وآله وسلم – وشرَّ الأمورِ محدثاتُها وكلَّ محدثةٍ بدعةٌ ، وكلَّ بدعةٍ ضلالةٌ ، وكلَّ ضلالةٍ في النَّار(*).

---

(1) سورة آل عمران : الآية ، 102. (2) سورة النساء : الآية ، 1. (3) سورة الأحزاب : الآية ، 71.

(*) هذه الخطبة ؛ تسمَّى : «خطبة الحاجة» وهي تشرع بين يدي كلِّ حاجة ، والتي كان رسول الله ﷺ يعلِّمها أصحابه ؛ أن يقولوها بين يدي كلامهم ، في أمور دينهم سواء كان ؛ خطبة نكاح ، أو جمعة ، أو محاضرة ، أو غير ذلك ، وهي في : «سنن ابن ماجه» كتاب النكاح ، باب خطبة النكاح ، وفي : «سنن الترمذي» و «سنن أبي داود» و «سنن النسائي» ورواه أبو يعلىٰ في : «مسنده» والطبراني في : «المعجم الكبير» والبيهقي في : «سننه» والإمام أحمد في : «المسند» ، وورد ذكر طرف من هذه الخطبة في : «صحيح مسلم» كتاب الجمعة ، باب خطبته ﷺ في الجمعة.

# KİTABIN İÇİNDƏKİLƏR

# XUTBƏTUL-HACƏ*

Həmd ancaq Allahadır, Ona həmd edir, Ondan yardım və məğfirət diləyirik. Nəfslərimizin şərindən və pis əməllərimizdən Allaha sığınırıq. Allah kimi hidayətə yönəltmişsə, onu heç kəs azdıra bilməz, kimi də azdırmışsa, heç kəs onu hidayətə yönəldə bilməz. Mən şəhadət edirəm ki, Allahdan başqa ilah yoxdur. O, təkdir, şəriki də yoxdur və şəhadət edirəm ki, Məhəmməd onun qulu və elçisidir.

**«Ey iman gətirənlər! Allahdan lazımınca qorxun. Yalnız müsəlman olduğunuz halda ölün».** (Ali-İmran 102).

**«Ey insanlar! Sizi tək bir şəxsdən** (Adəmdən) **xəlq edən, ondan zövcəsini** (Həvvanı) **yaradan və onlardan da bir çox kişi və qadınlar törədən Rəbbinizdən qorxun**. (Adı ilə) **Bir-birinizdən** (cürbəcür şeylər) **istədiyiniz Allahdan, həmçinin qohumluq əlaqələrini kəsməkdən qorxun. Şübhəsiz ki, Allah sizin üzərinizdə nəzarətçidir».** (ən-Nisa 1).

**«Ey iman gətirənlər! Allahdan qorxun və doğru söz söyləyin!** (Əgər belə etsəniz) **Allah əməllərinizi islah edər və günahlarınızı bağışlayar. Hər kəs Allaha və Peyğəmbərinə itaət etsə, böyük bir səadətə** (Cənnətə) **nail olar».** (əl-Əhzab 70-71)[1].

Şübhəsiz ki, sözlərin ən doğrusu Allahın kəlamı, yolların ən xeyirlisi Muhəmməd - *sallallahu aleyhi və səlləm* - in yoludur. Əməllərin ən pisi sonradan uydurulanlardır. Sonradan uydurulub dinə salınan hər bir əməl (iş) bir bidətdir, hər bir bidət isə zəlalətdir (sapıqlıqdır), hər bir zəlalət isə oddadır[2].

---

* ***XUTBƏTUL-HACƏ*** ismiylə adlanan bu duanı Peyğəmbər *- sallallahu aleyhi və səlləm –* cümə və s. xütbələrdə oxumuşdur. Səhabələrinə də bunu əmr etmiş və özü də onları öyətmişdir. Müslim 867, Nəsəi 3/188.

[1] Hədisin ilk hissəini – Əhməd 1/392-393,432, Əbu Davud 2188, Tirmizi 1105, Nəsəi 3/104-105, 6\69 və «Əməlul Yəum vəl Leyl» 488, İbn Məcə 1892, Darimi 2202, Tayalisi «əl-Musnəd» 1557, Abdurrazzaq «əl-Musənnəf» 10449, Bəzzar «əl-Musnəd» - Kəşful Əstar 1/314, Əbu Yəla «əl-Musnəd» 5233-5234,5257, Tahavi «Şərhul Müşkilil Asar» 1-3, Təbərani «Məcmuul Kəbir» 10/10079-10080, Həkim «əl-Mustədrək» 2744, Beyhəqi «Sünnənul Kubra» 3/214-215, Bəğavi «Şərhus Sunnə» 2268 İbn Məsud *- radıyallahu anhu –* yolu ilə, Müslim «Şərhu Nəvəvi» 6/156-158, Əhməd 1/302,350, Nəsəi 6/89-90, İbn Məcə 1893 və Tahavi «Şərhul Müşkilil Asar» 4 İbn Abbas *- radıyallahu anhu –* yolu ilə, Tahavi «Şərhul Müşkilil Asar» 5, Beyhəqi «Sünnənul Kubra» 3/215 Nubeyt b. Şərit *- radıyallahu anhu –* yolu ilə, Əbu Yəla «əl-Musnəd» 7221, Nəsəi «Sünnənul Kubra» bax: «Tuhfetul Əşraf» 6/472 № 9148 Əbu Musa əl-Əşari *- radıyallahu anhu –*yolu ilə - **(K.H).**

[2] Hədisin ikinci hissəsini – Müslim «Şərhu Nəvəvi» 6/153-156, Əhməd 3/319,371, Nəsəi 3/188-189, Beyhəqi «Sünnənul Kubra» 3/214 Cabir b. Abdullah *- radıyallahu anhu –* yolu ilə. Bu ləfz Nəsainin ləfzidir. Hədisi Əhməd 3/371 və Müslim: «Sözlərin ən doğrusu» ləfzi yerinə: «Sözlərin ən xeyirlisi» ləfziylə rəvayət edilmişdir. İmam Əhmədin digər rəvayətlərində isə 3/319: «Sözlərin ən gözəli» şəkilindədir. Müslim: «Sonradan uydurulub dinə salınan hər bir əməl (iş) bidətdir» ləfzi yerinə: «Hər bir bidət bir zəlalətdir (sapıqlıqdır)» ləfziylə ravayət etmişdir. Hədisin sonunda olan: «Hər bir zəlalət isə oddadır» ləfzini zikr etməmişdir. Bu beş səhabədən başqa hədsi: Aişə *- radıyallahu anhə –*, Səhl b. Sad *- radıyallahu anhu –* mərfu olaraq. **MƏRFU HƏDİS -** Bu o, hədisdir ki, hansısa bir əməlin, sözün və ya sifətin Peyğəmbər *– sallallahu aleyhi vəs səlləm –* ə çatması mərfu hədis adlanır. 1. əl-Mərfu əl-Qövli - Peyğəmbər *– sallallahu aleyhi vəs səlləm –*in dediyi söz. 2. əl-Mərfu əl-Feli - Peyğəmbər *– sallallahu aleyhi vəs səlləm –*in etdiyi əməl. 3. əl-Mərfu əl-Təqriru - Peyğəmbər *– sallallahu aleyhi vəs səlləm –* in görüb qadağan etmədiyi (hər hansısa bir əməl, və ya söz). 4. əl-Mərfu əl-Vəsfiyu - Peyğəmbər *– sallallahu aleyhi vəs səlləm –*in ən gözəl əxlaqlı olması. Tabiinlərdən isə İbn Şihab əz-Zuhri isə mursəl olaraq rəvayət etmişdir. **MURSƏL HƏDİS -** Tabiin Peyğəmbər *– sallallahu aleyhi vəs səlləm –* dən danışır. Lakin onlar arasındakı ravini qeyd etmir. Səhabədən də

# REDAKTORDAN

**«Ey Rəbbim! köksümü açıb genişlət, işimi yüngülləşdir, dilimdəki düyünü aç ki, sözümü yaxşı anlasınlar».** (Ta ha 25–28).

Möhtərəm müsəlman qardaş və bacılarım! İlk öncə hamınızı Allahın salamı ilə salamlayıram. Allahın kitabına və Rəsulullah - *səllallahu aleyhi və səlləm* – in yoluna uyaraq bu tərcümə işinmizi «Bismilləh» ilə başlayıram. Çünkü Allah Rəsulu - *səllallahu aleyhi və səlləm* - də öz məktublarını «Bismilləh» ilə başlamış və buyurmuşdu: «Hər mühüm bir işə «Bismilləh» ilə başlanılmazsa, o işin sonu kəsikdir»[3].

Allah – *subhənəhu və təalə* – yə şükürlər olsun ki, İslamın möhtərəm alimlərindən biri olan Şeyx Albani – *rahmətullahi aleyhi* – nin «Namazı tərk edənin (qılmayanın) hökmü» adı ilə məşhur olan bu kitabını tərcümə etməyi bizə nəsib etdi. Bütün nemətlərinin qarşılığında ona həmd edirəm, Lütf və Kərəmiylə bunların daha da artırılmasını ondan diləyirəm. Şəhadət edirəm ki, Allahdan başqa heç bir ilah yoxdur, bir və təkdir, şəriki də yoxdur, tək və Qahhardır (hər şeydən qüdrətli, hər şeyi məğlub edən). Kərim (kəramətli, səxavətli) və Ğaffardır (günahlardan qoruyandır).

Əsrimizin dahi İslam alimlərindən və tədqiqatçılarından biri də mühəddis Şeyx Albani – *rahmətullahi aleyhi* – dir. Bu ad nə inki islam ölkələrində hətta islam ölkələrindən kənara çıxaraq Avropa, Amerika və s. kimi dövlətlərdə də çox tanınmışdır. Minlərlə, miliyonlarla müsəlmanların qəlbində bu şəxsiyyətə qarşı sevgi, məhəbbət vardır. Çünki Əbu Hureyrə - *radıyallahu anhu* – nun rəvayət etdiyi hədisdə də Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurur: «Əgər Allah bir qulu sevərsə əmr edir Cəbrailə: «Şübhəsiz Allah filan qulu sevir, sən də onu sev!» deyə nida edər. Cəbrail də onu sevər. Sonra Cəbrail da səmadakıları səsləyərək: «Şübhəsiz Allah filan qulu sevir, siz də onu sevin!». Səmadakılar da onu sevərlər. Sonra da onun sözü yer üzündə məqbul (qəbul) sayılar»[4]. Çox istərdim ki, Allahın dininin keşikçisi olan bu gözəl insan Azərbaycan xalqı da tanısın və daima da onu yad etsinlər.

Şeyx Albani – *rahmətullahi aleyhi* – Alban dövlətinin keçmiş mərkəzi olan Aşkodra şəhərində hicri 1332-ci ildə (miladi tarixi ilə 1914-cü ildə) dünyaya gəlmişdir. Əsli Albaniyadan olduğuna görə ləqəbi də əl-Albanidir. Kunyəsi isə Abu Abdur-Rahməndir. Çox kasıb bir ailədən idi. Atası Məhəmməd Nəsrəddin b. Nuh Nəcətiy b. Adəmdir. Nuh Nəcəti Osmanlı dövlətinin mərkəzi olan (İstambul) Astana şəhərinin şəriət mədrəsəsində dini təhsil aldıqdan sonra Allahın dininə xidmət etmək üçün öz ölkəsinə qayıdır. Lakin o, vaxtlar Albaniyada ateizim (Allahsızlıq) ideyası çox yayıldığına görə ailəsi ilə birlikdə

---

mursəl rəvayət olur. Bu o, deməkdir ki, səhabə Peyğəmbər – *sallallahu aleyhi vəs səlləm* – in sözünü eşitmədən, əməlini görmədən danışır. Bu da onun o, vaxt uşaq olması və ya İslamı sonra qəbul etməsi ilə izah olunur. Bunlar da qəbul edilə bilər. Hədis səhihdir. Muhəddis Muhəmməd Nəsrəddin əl-Albani – *rahmətullahi aleyhi* – hədisin bütün rəvayətlərini bir yerə toplayaraq «Xutbətul Həcə» isimli bir kitab yazmışdır. İstəyənlər bu kitaba baxa bilərlər. Ayrıca bax: əl-Albani «Muxtəsər Səhih Müslim» 409, «Mişkətul məsabih» 3149,5860 - **(K.H).**

[3] Əbu Davud.

[4] Buxari, Müslim.

Suriyanın Dəməşq şəhərinə hicrət edirlər. Dəməşqə köçdükdə gənc alimin 9 yaşı vardır. İlk təhsilini də elə bu şəhərdə alaraq Qurani Kərimi öyrənməyə başlayır. Quranı oxumaq qaydalarını (təcvidi), ərəb dili ilə bağlı bir çox məsələləri, həmçinin Hənəfi məzhəbinin qanunları ilə yaxından tanış olur (Məraqil Fərəh[5]). Bütün bulara Dəməşqin şeyxlşəri olan Məhəmməd Səid əl-Burhani və Məhəmməd Bəhcə əl-Beytərinin dərslərində iştirak edərək nail olur. Həmçinin bu işdə onun atasının da böyük rolu olmuşdur. Bundan başqa atasından saat-sazlıq sənətini də öyrənməyə başlayır. Bu sənətdə yüksələrək sənətkar səviyyəsinə çatır. Onun saat köşkü indi də Dəməşqin yaxınlığında yerləşən Əməvi Məscidinin yaxınlığındadır. İyirmi yaşından başlayaraq Şeyx Albani hədis elmi ilə dərindən məşxul olmağa başlayır və ilk olaraq Hafiz əl-İrakinin «əl-Muqni ən-Həmlil Əsfər fil Əsfər fi Təhrici mə Filhiyə Minəl Əkbər» kitabını geniş şəkildə şərh və tədqiq edir. Hədis elmi ilə məşğul olmağına səbəb Misirdə çıxan «əl-Mənər» jurnalı olmuşdur[6]. Özüdə həmişə deyərdi ki, Məhəmməd Rəşid Rzanın bu jurnalını oxumağım mənə çox köməyi olub. Hədis elminə olan məhəbbəti o, qədər artır ki atasının (əsas hissəsi) Hənəfi məzhəbinin kitablarından təşkil edilmiş kitabxanası belə onun hədis elminə olan təlabatını elm öyrənmək alovunu söndürə bilmirdi (ödəmirdi). Lakin atası onun bu elmlə məşğul olmasına narazı idi və deyərdi ki, bu elm müflislərin elmidir. Maddi çətinlik gənc alimə kitabları əldə etməyə çətinlik törətdiyinə görə o, Dəməşqin böyük kitabxanası olan «əl-Məktəbətul əz-Zahriyyə» gedər və oradan kitabları götürərdi. Şeyx Albani hədis elmi ilə o, qədər aludə olur ki, öz saat dükanını bağlayaraq 8-12 saat və bəzən də daha çox vaxtını kitabxanada keçirərdi. Yalnız namazdan-namaza kitabxanadan çıxardı. Hətta bəzən o, qədər elmə bağlanardı ki. nahar etməyə də getməzdi. Özü ilə gətirdiyi bir tikə çörək ilə kifayətlənərdi. Kitabxananın müdriyyəti onun elmə olan həvəsini gördükdən sonra onun üçün müəyyən bir otaq ayırırlar və kitabxananın açarlarını ona verirlər. Bu müddət ərzində gənc alim fiqhə, əqidəyə dair bir çox əsrlər yazır. Bu əsərlərin bəziləri hələ indiyə qədər də nəşr edilməmişdir. Gənc alim bu yolda çoxlu çətinliklərlə qarşılaşır. Lakin bütün bunlara baxmayaraq səbr və ixlasla bütün bu çətinliklərdən qalib çıxır. Bu işdə ona Dəməşqin bir çox tanınmış şeyxləri olan Baxcatul Baycar, imam AbdulFəttah və Taufiq əl-Bərzaq – *Allah onlardan razı olsun* – ona nəsihətlər verərək bu işdə daha da iradəli və qəti olmağı tövsiyə etmişlər. Bir müddətdən sonra gənc alim həftədə iki dəfə dərslər verməyə başlayır. Moizələrlə, elmi çıxışlarla Suriya, İordaniya, Misir, Qatar, Kuveyt, İspaniya, İngiltərə və s. dövlətlərə səfərlər edir. Hicri 1381-1383-cü illər ərzində Mədinə İslam Universitetinə hədis elmindən dərs vermək üçün dəvət alır. Bu illər ərzində Universitetin fəxri üzvü, bir müddətdən sonra isə Universitetin fəxri professoru adını alır. Hədis elmi ilə bağlı yüzlərlə əsərləri və araşdırmaları vardır. Şeyx Albani – *rahmətullahi aleyhi* – nin təhqiq etdiyi kitablardan: «Buxari, Müslim, Tirmizi, Əbu Davud, Nəsəi, İbn Məcə və s Səhih və Sünnən kitabları, Cəmius Səğir, Mişkətul Məsabih, Seyid Sabiqin «Fikhus Sünnə», Şeyx

[5] Hənəfi məzhəbinin məşhur kitablarındandır.
[6] Bu jurnalda Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in hədisləri haqqında geniş məlumat verilirdi.

Kardavi «İslamda halal və Haram», İmam Nəvəvi «Riyadus salihin», İmam Buxari «Ədəbul Mufrad», İmam Zəhəbi «əl-Uluv» və s məşhur kitabların təhqiqini etimişdir. Həmçinin 10-12 cilddən ibarət olan «Səhih Hədislər Silsiləsi» isimli kitabında yalnız səhih hədislər və eyni ilə də «Zəif Hədislər Silsiləsi» isimli kitabında isə yalnız zəif hədisləri toplamışdır. Bütün bu işlərin nəticəsidir ki, hər bir müsəlman onun təhqiq etdiyi kitabları oxuduqda asantlıqla səhih hədisi zəif və uydurma hədislərdə ayıra bilir. Bundan başqa Şeyx Albani – *rahmətullahi aleyhi* – nin İslamın əsaslarına dair gözəl əsərləri vardır. Bunların içərisində «Sifətu Salətu ən-Nəbiyyə min Təkbir ilə Təslim» (Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in namaz qılma şəkili), «Mənasikul Həcc vəl Umrah fi Kitabi və sunnah və Asari əs-Sələf» (Həcc və Ümrə ehkamları Kitab, Sünnə və Sələglərin gözü ilə) və s. Özündən sonra bir çox görkəmli İslam alimlərini qoyub getmişdir. Bunlardan Şeyx Həmdi AbdulMəcid, Şeyx Məhəmməd Abbasi, Ömər Süleyman əl-Aşkar, Şeyx Muqbil b. Hadi əl-Vadii, Şeyx Məhəmməd İbrahim Şakra, Şeyx Ali Xuşşah, Şeyx Məhəmməd Cəmil Zinu, Şeyx AbdurRahman AbdusSaməd, Şeyx Səlim əl-Hilali, Şeyx Ali Həsən AbdulHəmid əl-Hələbi, Şeyx Məhəmməd Saleh əl-Munəccid və s. Şeyx Albani – *rahmətullahi aleyhi* – Hicri 1420-ci il 22 Dumada əs-Səniyyə ayında (miladi tarixi ilə 2 oktyabr 1999-cu ildə) 87 yaşında mübarək və xeyirli bir ömür sürərək dünyasını dəyişmişdir. Allah ona rəhmət etsin!

Əlimizdə olan bu əsər də çox mühüm bir məsələni özündə əks etdirir. Şeyx Albani – *rahmətullahi aleyhi* – bu məsələyə də haqqını verərək ətraflı və geniş bir şəkildə onu izah edərək bizim öhdəliyimizə vermişdir.

Allahdan bu çalışmamın dolğun, düzgün şəkildə tərcümə edib başa çatdırılmasını diləyirəm. Allahdan əməlimi onun üçün ixlaslı olmasını, məndən qəbul edib onunla müsəlmanları faydalandırmasını diləyirəm. Əgər haradasa xəta etmişəmsə bu məndəndir. Mənim acizliyimdən və çarəsizliyimdəndir. Şeytandan və carəsizlikdən Allaha sığınıram. Burada düzəldilməsi mühüm olan yerləri tapdıqdan sonra mənə öyüt-nəsihət verəndən, xətalarımı və səflərimi mənə bəyan edəndən Allah razı olsun. Allah onu xeyirlə mükafatlandırsın. Mən ona əvvəlcədən öz təşəkkürümü bildirirəm. Ayrıca bu kitabı yazmaqda mənə kömək edən, bu kitab da zəhməti olan, öyüt vermək və ya dua etmək məqsədilə mənə yardım edən hər bir kəsə təşəkkür edirəm. Allah onları da xeyirlə mükafatlandırsın.

Güvəndiyim Allahdır, işlərimi Ona həvalə edirəm və Ona arxalanıram. Həmd və nemət yalnız Onadır. Müvəffəqiyyət bəxş edən və xətalardan qoruyan da Odur. **«Məni yaradan və məni doğru yola yönəldən Odur! Məni yedirdən də, içirdən də Odur! Xəstələndiyim zaman mənə yalnız O şəfa verir. Məni öldürəcək, sonra dirildəcək də Odur və Qiyamət günü xətamı bağışlayacağına ümid etdiyim də Odur! Ey Rəbbim! Mənə hikmət bəxş et və məni salehlərə qovuşdur! Sonra gələnlər arasında mənə yaxşı ad qismət et! Məni Nəim Cənnətlərinin varislərindən et».** (əş-Şuəra 78-85).

Allahın salat və salamı onun Peyğəmbəri Muhəmməd - *sallallahu aleyhi və səlləm* - ə, onun ailə üzvlərinə, səhabələrinə və Qiyamətə qədər onun yolu ilə gedən əməlisaleh möminlərin üzərinə olsun.

**BİTİRDİM: HİCRİ 1426-Cİ İL 9 MƏHƏRRƏM**
**MİLADİ 19 FEVRAL 2005-Cİ İL**

# TƏRCÜMƏÇİNİN MÜQƏDDİMƏSİ

**«Onlardan sonra gələnlər belə deyirlər: «Ey Rəbbimiz! Bizi və bizdən əvvəl iman gətirmiş qardaşlarımızı bağışla. Bizim qəlblərmizdə iman gətirənlərə qarşı kinə, həsədə yer verme. Ey Rəbbimiz! Sən həqiqətən, şəfqətli və mərhəmətlisən!»** (əl-Həşr 10). **«…Ey Rəbbimiz! Unutduqda və ya yanıldıqda bizi cəzalandırma!…Bizi əfv edib bağışla, bizə rəhm et!»** (əl-Bəqərə 286). **«…Ey Rəbbimiz! Bizə dünyada da, axirətdə də gözəl nemətlər ver, bizi Cəhənnəm əzabından qoru!»** (əl-Bəqərə 201).

Həcmi kiçik, lakin dəyəri böyük olan bu kitabı tərcümə etməyimin məqsədini aşağıdakı kəlimələrlə izah etmək istəyirəm.

**BİRİNCİSİ:** Sələf və Xələf alimləri namazın vacibiyyətnə iman etdiyi halda, tənbəllik səbəbi ilə namazı tərk edən kimsənin küfrü, bu küfrün sahibini İslam millətindən çıxardıb çıxarmadığı və ona veriləcək cəza haqqında ixtilaf etmişlər. İxtilaf edən tərəflərdən bu mövzuda kitab yazan bəziləri, görüşünə uyğun gələn tərəfin dəlillərini üstün tutub, onları təfsir və şərh edərək məsələni hər tərəfli izah edərkən qarşı tərəfin dəlillərini ya görməməzlikdən imtina etmiş ya da onları dəlil olmaqdan çıxartmaq üçün mümkün olan hər şeyi etmişdir.

Namazın tərk edilməsinə aid kitab yazanlardan biri də Şeyx əl-Albani – *rahmətullahi aleyhi* – dir. Bu məsələdə əl-Albani – *rahmətullahi aleyhi* – tərəflərin dəlillərini cəm etməsi, onlardan birini qəbul edib, digərini rədd etmək əvəzinə onların səhih olan dəlillərinin hamısı ilə əməl etmək yolunu üstün tutması bizi bu kitabı tərcümə etməyə yönəldən səbəblərdən biri olmuşdur. Çünki Əhli Sünnə vəl Cəmaatın üsullarından biri də imkan olduğu halda dəlillərin arasını cəm etmək üsuludur. Digər tərəfdən kitab bu mövzuda mənim düşüncələrimə əhatəli olaraq aydınlıq gətirməkdədir. Lakin mənim burada zikr etmək (demək-**(K.H)**) istədiyim bir neçə kəlimə vardır.

Tərk etməklə sahibini - İslam millətindən çıxaran - təkfirə səbəb olan namaz qılmamaq ilə, sahibini Allahın istəyinə (diləməsinə) tərk edən namaz qılmamağı bir-birindən ayırd etmək lazımdır.

Namazı tərk etmək mütləq bir ifadədir. Bu ifadədən namazın bir vaxtını tərk etmək və ya bəzən qılıb, bəzən də qılmamaq başa düşüldüyü kimi, heç namaz qılmamaq və ya təmamən tərk edib onda israr etmək də başa düşülür. Həyatı boyu heç vaxt namaz qılmayan və bu hal üzərində ölən və ya namaz, oruc və başqa ibadətlər haqqında söhbət olunduqda bunu ikrah hissi ilə qarşılayan və hər tərəfdən köksünü küfrə açdığı bəlli olan və ya öldürülməyi namaz qılmaqdan üstün tutacaq qədər namaza kin bəsləyən kimsələrə aid edilən nasları (Quran və Sünnə-**(K.H)**), namazın dindəki həqiqi yerini bilməyən, nəfsinə və cəmiyyətin ənənəvi din anlayışına məruz qalmış cahil bir xalqa uyğunlaşdırmaq səhf fikirdir. Çünkü belələrinə dindən, imandan, namazdan və s. ibadətlərdən söhbət etdikdə qəlbləri yumşalar, hətta gözləri yaşla dolar və ağlayarlar. Sonra dərhal namaza başlayarlar. Cümə namazlarını qaçırmadıqları kimi Ramazan ayında da məscidlərdən çıxmazlar. Bunlarla, həyatında Rəhmana bir dəfə də belə olsun səcdə etməyən, üzündə küfrün izlərini daşıyan zalımlarla bir tutmaq heç də doğru deyildir. Bu eyni zamanda təkfir edən naslarla, Allahın istəyinə buraxan nasları mümkün qədər cəm etməməkdir. Necə olursa olsun Quran və

Sünnətdə gələn təkfir nasları birinci qrup namazı tərk edənlərə, Allahın istəyinə buraxan nasları isə ikinci qrup namazı tərk edənlərə aid etmək məcburiyyətindəyik.

Buna aid iki misal gətirərək izah etməyə çalışacağam. Quranda varid olan: **«Onlardan sonra namazı tərk edib şəhvətə uyan bir nəsil gəldi. Biz onları** (Cəhənnəmdəki) **Ğəyy dərəsinə atacağıq»** (Məryəm 59). **«Sizi Cəhənnəmə salan nədir?» Onlar deyəcəklər: «Biz namaz qılanlardan deyildirk, yoxsula da yedirtmədik, batilə dalanlarla birlikdə biz də dalardıq, haqq-hesab gününü yalan saydıq»** (əl-Muddəssir 42-46). Bu kimi ayələrlə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən rəvayət edilən: «Şübhəsiz ki, namazı tərk etmək kişi ilə küfr arasındadır»[7] və «Bizimlə onlar arasındakı əhd namazdır. Kim bu namazı tərk edərsə küfrə girər»[8] kimi hədisləri birinci qrup namazı tərk edən kimsələrə aid edib.

**«Həqiqətən Allah** (heç kəsə) **zərrə qədər zülm etməz. Əgər yaxşı bir əməl baş verərsə, onu** (savabını) **ikiqat artırar və öz tərəfindən də** (bu əməlin sahibinə) **böyük mükafat verər»** (ən-Nisa 40). (Ya Peyğəmbər! Mənim adımdan qullarıma) **de ki: «Ey mənim** (günah törətməklə) **özlərinə zülm etməkdə həddi aşmış bəndələrim! Allahın rəhmindən ümidsiz olmayın. Allah** (tövbə etdikdə) **bütün günahları bağışlayar. Həqiqətən O bağışlayan və rəhm edəndir»** (əz-Zumər 53). **«Allah ona şərik qoşmağı bağışlamaz. Bundan başqa olan günahları isə istədiyi şəxsə bağışlayar»** (ən-Nisa 116) və buna bənzər ayələrlə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən rəvayət edilən: «Allah – *subhənəhu və təalə* – qullarına beş vaxt namaz fərz qılmışdır. Kim bu namazları səhlənkarlıq etmədən və qəsdən heç bir vaxtı tərk etmədən haqqı ila yerinə yetirərsə, Allah onu Cənnətinə daxil edəcəyinə dair söz vermişdir. Kim də bu beş vaxt namazı qılmazsa Allahın ona heç bir sözü yoxdur. İstərsə onu Cənnətə daxil edər, istərsə də əzab verər (təhqiqi irəlidə gələcək)» və «Qiyamət günü qulun ilk olaraq hesaba çəkiləcəyi şey heç şübhəsiz ki, namazıdır. Qul onu (qılaraq) tamamlamışsa nə gözəl. Yox (əgər onları tamamlamamışsa), onun nafilə namazlarına baxın var mı? deyilər. Qulun nafilə namazı varsa onlarla fərz namazları tamamlanar. Sonra digər əməllərin də (hesabı) belə edilər»[9] və buna bənzər bir

---

[7] Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurur: «Kişi (bir rəvayətdə: qul) ilə şirk və küfr arasında namazı tərk etməkdən başqa bir şey yoxdur. Qul onu buraxdığı zaman heç şübhəsiz ki, şirkə (bir rəvayətdə: küfrə) düşmüş olur» və ya «Küfr ilə iman arasında namazı buraxmaq vardır». Müslim 82, Əhməd 3/370,389, Əbu Davud 4678, Tirmizi 2618-2620, İbn Məcə 1078-1080, Məhəmməd b. Nəsr əl-Mərvəzi «Tazimu Kadris Salah» 886-892 və s. Cabir b. Abdullah - *radıyallahu anhu* – dan. əl-Albani «Səhihul Cəmius Səğir» 2848-2849,5388, «Səhihut Tərğib» 1/298,560,565, «Mişkətul Məsabih» 569 - **(K.H).**

[8] Əhməd 5/346,355, Tirmizi 2621, Nəsai 1/231-232, İbn Məcə 1079, İbn Əbi Şeybə «əl-Musənnəf» 30387, İbn Hibban «əl-İhsan» 1454, Darakutni 1733, Beyhəqi «Sünnən Kubra» 3/366, «Şuabul İman» səh. 43 və s. Bureydə b. əl-Husayb əl-Əsləm - *radıyallahu anhu* – dan. əl-Albani «Səhihut Tərğib» 561, «Səhihul Cəmius Səğir» 4143, «Mişkətul Məsabih» 574 - **(K.H).**

[9] Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günü insanların əməllərindən ilk hesaba çəkiləcək əməlləri namazlarıdır. Rəbbimiz olan Allah hər bir şeyi gözəl bildiyi halda mələklərə: «Qulumun namazına baxın onu tam mı yoxsa əskik mi qılmışdır?» deyə buyurar. Əgər namazı tam isə ona tam olaraq yazılır. Yos əgər ondan bir şey əskiksə: «Qulumun hər hansı bir nafilə namazının olub olmadığına baxın» deyə buyurar. Əgər nafilə

çox misalları da ikinci qrup namazı tərk edən kimsələrə aid etmək lazımdır. Şingiti – *rahmətullahi aleyhi* – bu hədislə bağlı belə demişdir: «Bu hədis də namazı tərk edənin küfrə girmədiyinə dəlil tərəfi; nöqsan olan fərz namzların və onların nafilələrlə tamamlanması - hədisin ümumi mənası etibarı ilə – namazlardan bəzisini qəsdən tərk etməsi mənasına gəlir. Görüldüyü kimi hədisin ləfzinin (mətninin-**(K.H)**) ümumi - təviliz olaraq - bunu söyləyir» (Ədvaul Bəyan 3/453).

İmam İbni Cərir– *rahmətullahi aleyhi* –: **«Onlardan sonra namazı tərk edib şəhvətə uyan bir nəsil gəldi…»** ayəsinin təfsirində belə demişdir: «Mənə görə ayənin ən gözəl təfsirini ayəni «namazı tamamən tərk etmələri və heç qılmamalarıdır» şəkilində izah edənlərin təfsiridir. Çünkü Allah ayənin davamınca buyurur: **«Tövbə edib iman gətirən və yaxşı işlər görənlərdən başqa…»** (Məryəm 60). Bu ayələr isə yuxarıdakı təfsirin doğruluğunu sübut etməkdədir. Bu ayədə namazı tərk edənlərlə qəsd edilən kimsələr, mömin olduğu halda namazı qılmayan kimsələr olsalardı Allah: **«Tövbə edib iman gətirən»** deyə buyuraraq iman edənləri istisna etməzdi. Əksinə ayədə olan namaz qılmayanlar imansız kafirlərdir. Allah üçün heç namaz qılmadıqları kimi, fərzlərdən heç birini də yerinə yetirmirlər» (Təfsir Təbəri 16/84-85).

Şeyxulislam İbn Teymiyyə – *rahmətullahi aleyhi* – belə demişdir: «Namazı tərk etməkdə israr edib heç qılmayan və namazı qılmamaqla israr edərək ölən kimsəyə gəlincə belə bir kimsə müsəlman olmaz. Lakin insanların bir qismi bəzən namaz qılır bəzən də namazı tərk edirlər. Bax bu kimi kimsələr **VAİD** (yəni: Allahın istəməsi (diləməsi) altındadırlar. Allah istərsə onları bağışlayar, istərsə əzab verər-**(K.H)**) altındadırlar» (Məcmuu Fətava 22/49).

Namazı qılmamaq insanın təkfir olunmasına səbəbdir sözünün mənası; onu tamamən tərk etmək və heç qılmamaqdır. Bu ifadə ilə qəsd edilən mənanın namazı bəzən qılmamaq və ya onu (namazı-**(K.H)**) qılmaqla bərabər müəyyən olunmuş vaxtlarını mühafizə etməmək olmadığına: **«Beləliklə o, nə təsdiq etdi, nə də namaz qıldı. Amma yalan saydı,** (imandan da) **üz döndərdi»** (əl-Qiyamə 31) bu ayə də dəlildir. Ayədə küfrə səbəb olaraq Quranı təsdiq etməmək və ondan üz döndərmək zikr edilmişdir. Beləliklə namazı heç qılmayan və onda israr edənlərə nisbətən, namazı tərk edənin ayədə qəsd edilən üz döndərən kimsələrdən olmadığı açıq aydındır.

Şeyx Şingiti – *rahmətullahi aleyhi* – namazı tərk etməklə bağlı olan məsələlərdə tərəflərin dəlillərini və mövzu ilə əlaqəli olan görüşlərini (fikirlərini-**(K.H)**) zikr etdikdən sonra öz görüşlərini bu şəkildə açıqlamışdır: «Mənə görə dəlil olaraq sözlərin ən doğrusu namazı tərk etmək (əməli) küfürdür deyib, izahını hədis və fiqh[10] üsullarının vasitəsi ilə icra edən cumhurun[11] görüşüdür. Onlara görə mümkün qədər dəlillərin arasını cəm etmək vacib olduğu üçün namazı tərk

---

namazları varsa: «Qulumun fərz namazlarını nafilələrlə tamamlayınız» deyə buyurar. Daha sonra digər əməlləri də bu şəkildə həsaba alınır». Əbu Davud 1/540-541, hədis № 864, əl-Albani «Səhih Sünnən əbu Davud» 1/163, hədis № 770 - **(K.H).**

[10] Lüğətdə – anlamaq, başa düşmək mənasıdadır. İstilahi (şəriətdə isə) mənası – Quran və Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in sünnəsindəki (hədislərindəki) dəlillərdən çıxarılan şəriət hökmləri ilə bağlı olan elm - **(K.H).**

[11] Cumhur – alimlərin çox hissəsinin üzərində ittifaq etdikləri fikir - **(K.H).**

edənin küfrü sahibini İslam millətindən çıxaran küfr deyildir. Hədislərdə zikr edilən küfr və şirk ləfzləri sahibini İslam millətindən çıxarmayan küfrə aid edildikdə dəlillərin arası cəm edilmiş olur. Dəlillərin arasını imkan olduqda cəm etmək, biri ilə əməl edib digərini əməldən salmaqdan daha münasibdir. Bu eyni zamanda hədis və fiqh üsulunda bilinən bir qaydadır».

İmam Nəvəvi – *rahmətullahi aleyhi* –: «Şərhul Muhəzzəb» isimli kitabında təmbəllik səbəbi ilə namazı tərk edənin, İslam millətindən çıxan küfrlə kafir olmadığını iddi edən alimlərin dəlillərini bəyan etdikdən sonra belə deyir: «Müsəlmanlar namazı tərk edəni **VARİS** (miras alan) və **MƏVRUS** (mirası alınan) kimi qəbul etmişlər. Əgər namazı tərk etmənin küfrü məğfirət olunmayan (bağışlanılmayan) küfr olsaydı müsəlmanlar onu nə varis nə də məvrus deyə qəbul etməzdilər».

Namazı təmbəllik səbəbi ilə tərk edəni Cabir, Bureydə, İbn Şaqiq və s. başqalarının rəvayət etdiyi hədislərlə dəlil gətirərək təkfir edənlərə cavaba gəlincə bu belədir[12]: «Onların hamısı namazı tərk edənin kafirlərə bəzi hökmlərdə bənzəməsi mənasına gəlir. O, da namazı qılması üçün tövbəyə dəvət edilməsi və ya öldürülməsidir. Hədisləri cəm edib təfsir etmək və zikr etdiyimiz qaydalara bağlı qalmaq isə vacibdir» (Ədvaul Bəyan 3/456).

**İKİNCİSİ:** Bəzi kimsələrin mütləq ifadəli nasları alıb, qeyd və bəyan edici nasları gözardı edərək, hər namaz qılmayanı mütləq şəkildə təkfir etmələrinin və uydurma icma iddialarının yersiz (əsilsiz) olduğunu ifadə edərək həqiqəti ortaya çıxarmaqdır. Bu kimi insanlara heyrət etməmək mümkün deyildir. Mövzu ilə əlaqəli alimlərin sözlərini nəql edərkən onlardan görüşlərinə (fikir və əqidələrinə-**(K.H)**) uyğun gələn hissələri alır, uyğun gəlməyən hissələri isə tərk edirlər. Bu hərəkət elmi əmanətə riayət edilməyən bir hərəkətdir. Məsələn: «Namazın tərk edilməsi ilə bağlı mövzuda İbn Teymiyyə – *rahmətullahi aleyhi* – nin sözlərini nəql edərkən buna bənzər bir şey baş vermişdir».

Şeyxulislam – *rahmətullahi aleyhi* –: «əl-Vasiyyətul-Kubra» əsərində belə demişdir: «…Həddi buluğa çatmış bir kimsə beş vaxt namazlardan bir vaxtı qılmaqdan imtina edərsə və ya üzərində ittifaq edilən fərzlərdən bəzisini tərk edərsə o, kimsə tövbəyə dəvət edilir. Tövbə edərsə (rahat buraxılır) əksi təqdirdə öldürülür». Alimlərdən bəzi kimsələr: «Namazdan imtina edib qılmayan mürtəd, kafir olur. Onun üçün cənazə namazı qılınmaz və o, kimsə müsəlmanların arasında dəfn edilməz» demişdilər. Digər bəzi alimlər isə: «Namazdan imtina edib qılmayan kimsə yol kəsən quldur və ya evli olaraq zina edən kimi olur» demişdilər.

Şeyxulislamın bu sözlərini bəzi kimsələr öz görüşlərinə uyğun gələcək şəkildə nəql edərkən altından xətt çəkilən yerləri nəql etməmişlər. Şeyxulislam alimlərin sözlərini nəql edərkən elmi əmanətə riayət göstərmiş, onun sözlərini nəql edənlər isə təəssüf ki, bu riayəti yerinə yetirməmişdilər. Şeyxulislamın sözlə-

[12] Abdullah b. Şaqiq əl-Ukaylı (ölmü h. 108) belə demişdir: «Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in səhabələri namazı tərk etməkdən başqa heç bir əməli tərk etməyi küfr olaraq görməzdilər» Tirmizi 2622, Hakim № 12, «əl-Mustədrək 1/48, əl-Albani «Səhihut Tərğib» № 562, «Mişkətul Məsabih» № 579, «Səhih Tirmizi» 2622, Şuayb Arnaut «Cəmiul Usul» 5/204 - **(K.H).**

rini burada olduğu kimi tam olaraq oxuyanlar[13] alimlərin bu məsələdə iki görüşü olduğunu başa düşürlər. Lakin onun bu sözlərini nöqsan olaraq nəql edən kimsələrin kitablarından oxuyanlar o, sözlərdən alimlərin bu məsələdə sadəcə bir görüşü olduğunu, bu görüşün də namaz qılmayanın tərkfir edilməsinin vacib olduğunu başa düşəcəklər. Ayrıca işarə edilən yerdə İmam İbni Hazm – *rahmətullahi aleyhi* – nin səhabələrin bu məsələdə icma etdiklərini ona iftira olaraq atıldığını da oxuyacaqlar[14]. Yeri gəlmişkən İmam İbni Hazm – *rahmətullahi aleyhi* – nin bu mövzudakı görüşlərini nəql etməkdə bir xələl görmürəm. İmam dəyərli kitabı «əl-Muhallə» 11/376-380-də Kitabul Muharib qisminin 2298-ci məsələsində mövzu ilə bağlı görüşləri belədir.

Vaxtı çıxana qədər namazı qəsdən tərk edənin öldürüləcəyi görüşündə olan İmam Məlik, İmam Şafii – *rahmətullahi aleyhi* – və s. imamların bu görüşlərini rədd edib, onla-rın dəlillərini zikr edərək və onlara cavablar verərək məsələni hər tərəfli öyrəndikdən sonra bunları söyləməkdədir: «…Yuxarıdan aşağıya doğru başa saldığımız şeylər Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in: «Sizlərdən kimsə bir münkər[15] görürsə gücü çatdığı qədər onu əli ilə dəyişdirsin…»[16] deyə buyurduğuna daxildir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in bu ifadəsi; namazı qılmaqdan, cünub ikən yuyunmaqdan, Ramazan orucundan, zəkat verməkdən, həcc etməkdən, bütün fərzləri bu şəkildə yerinə yetirməkdən imtina edərək münkər iş görən kimsənin tərbiyə edilməsi üçün bir əmrdir. Yuxarıda zikr etdiyimiz rükunları yerinə yetirməmək ümmət içərsində ittifaqla (yekdilliklə-**(K.H)**) münkər sayılır. Çünki onların hamısı haramdır. Haram da elə münkərin özüdür. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in əmri bu münkəri edənləri əllə vurmaq mübahdır və səhihdir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in təzir[17] cəzalarında on dəyənəkdən artıq vurulmaz hökmü də səhihdir. Bu görüşün dəlillərini «Təzir cəzaları nə qədərdir?» babında zikr edəcəyəm. Bu (namaz və s. ibadətlərdə də) hökum belə olduğu təqdirdə zikr olunan münkəri işləyənlərə on dəyənək vurmaq vacibdir. Vacib olan namaz və s. ibadətləri yerinə yetirərsə (dəyənəklə) vurulmaqdan azad olur və ona başqa bir cəza da yoxdur. Namaz qılmaqdan imtina etməyə davam edərsə, bu hərəkəti ilə başqa bir münkəri (günahda israr etmək münkərini) işləmiş olur. Dolayısı ilə yenə də dəyənək vurulur. Bu şəkildə təzir cəzası ona Allahın (onun-**(K.H)**)

---

[13] Şeyxulislamın mövzu ilə əlaqədər sözləri bir neçə səhifə bundan qabaq verilmişdir. İrəlidə kitabın içərisində onun görüşlərinə daha geniş yer veriləcəkdir.

[14] Zikr olunan nəqllərin sahibinin adının cəmaat içərsində pis hallanması olmasaydı əl-Muhəllə (2/242) isimli kitabında icma iddiasının İbn Hazm *– rahmətullahi aleyhi –* yə bir iftira olduğunu tərcüməsi ilə birlikdə Ərəbcə mətnini yuxarıda verir və oxuyucuya göstərərdim. Lakin mənim məqsədim insanları pisləmək deyil, onları elmi əmanətə riayət etməkdə «Əhli Sünnəyəm» deyənlərə bir nəsihətdir.

[15] Münkər olan iş yaxşı əməlin ziddidir. Şəriətin çirkin görüb haram qıldığı və xoşlamadığı hər şey münkərdir. Həmçinin Allahın bizə fərz qıldığı şeyləri etməmək də bir münkərdir – Lisanul Ərab 5/332 - **(K.H).**

[16] İmam Əhməd 3/49, Müslim 49,78, Əbu Davud 1140, İbn Məcə 4013, Nəsəi 5023 – **(M.Y).** Hədisin tam mətni belədir: Əbu Səid əl-Xudri *-radiyallahu anhu-* rəvayət edir ki, Peyğəmbər *–sallallahu aleyhi və səlləm-* buyurdu: «Sizdən kimsə bir münkər görərsə onu əli ilə dəyişdirsin. Əgər gücü çatmazsa dili ilə, bunu da bacarmadıqda qəlbi ilə (dəyişdirsin). Bu isə imanın ən zəif mərtəbəsidir» - **(K.H).**

[17] Peyğəmbər *–sallallahu aleyhi və səlləm–* tərəfindən təyin olunmayan cəzalar. Belə cəzalar İslam dövlətində qazılar tərəfindən təyin edilir - **(K.H).**

üzərindəki haqqını yerinə yetirincəyə və ya təzir cəzaları səbəbi ilə ölüncəyə qədər davam edər. Bu kimsədən (namazın) bir vaxtı çıxıb ikinci vaxtı girincəyə qədər dəyənək zərbələri əsla azaldılmaz. Yeni vaxtı girən namazın qılınması üçün təzir cəzaları təkrarlanır. Gecə yarısına qədər beləcə davam edər. İşa namazının vaxtı çıxdıqda vaxtı keçmiş namazları qıla bilməyəcəyindən dəyənək vurulması dayandırılır. Sonra sübh namazı vaxtının girməsi ilə dəyənək yenidən vurulur və sübh namazı vaxtının çıxmasına qədər davam edir. Sonra zöhr namazının ilk vaxtına qədər dəyənək vurulması dayandırılır. Sonra namazını qılan onu vurma işini əvəz edir. (Yəni-**(K.H)**) Başqa birisi namazını qıldığı vaxt vurma işini digəri əvəz edir, o biri isə namaza gedir. Nöbələşərək namazı tərk edən bu münkəri tərk edincəyə qədər və ya təzir cəzası səbəbi ilə ölüncəyə qədər davam edir. Onun (bu şəkildə) öldürülməsi isə doğrudur. Bununla belə o, kimsə müsəlmandır».

Bu sözlər namazı tərk edənin kafir və ya mürtəd olduğuna dair səhabə icmasının rəyini kitabında nəql edən (!) iftiraya uğrayan kimsənin sözləridir.

**ÜÇÜNCÜSÜ:** Şeyxləri təqlid etmənin kor etdiyi bəzi kimsələrin namazı və s. ibadətləri özlərinə qalxan edərək müsəlmanlara kafir və buna bənzər bəzi çirkin sifətləri vermələrinə və bu əməli də Sələfi Salihin və Əhli Sünnətə istinad etmələrinə gəlincə: Əhli Sünnə bu kimi bəsitlikdən uzaq olmaqları ilə bərabər bu insanların Allahın hüzurunda durub cavab vermələri də çox çətin olacaqdır.

Allah – *subhənəhu və təalə* – onlara: Mən sizə: **«Bilmədiyin bir şeyin ardınca getmə…»** (əl-İsra 36) deyə ayə göndərməmişdim mi? Cahillikləri səbəbi ilə məsələni qaynaqlarından (mənbələrindən-**(K.H)**) araşdıraraq öyrənmək imkanına sahib deyilkən, sırf birisini sevmək və onların səni yönəltmələri səbəbi ilə nədən müsəlmanlara: «Kafir, mürtəd» və s. sifətləri şamil etdin dediyində bu təqlidçilərin: **«Rəbbimiz! Biz ağalarmıza, böyüklərimizə itaət etdik, onlarsa bizi haqq yoldan azdırdılar».** (əl-Əhzab 67) deməmələrini təmənna edirəm. Bununla bərabər Allah *– subhənəhu və təalə –* onlara: Amma siz insanlara filan və filankəsi təqlid etməyi qadağan edirdiniz **«Siz insanlara yaxşı işlər görmələrinin əmr etdiyiniz halda, özünüzü unudursunuz?…»** (əl-Bəqərə 44) buyuruğunda şübhə yoxdur.

Muqallidlərlə[18] məsələmiz bu qədərlə bitməyəcəkdir. İnşəallah bu yaxınlarda İmam İbn Qeyyim – *rahmətullahi aleyhi* – nin «Təqlid Risaləsi» kitabında onların vəziyyətlərindən bəhs edən çox gözəl misallar və incə öyüdlər verilmişdır. Ümüd edilir ki, bəlkə bununla başlarını işlədərlər.

Nemətləriylə saleh əməlləri tamamlayan Allaha həmd olsun! Ey Allahım! Səni həmdinlə təsbih edirəm. Səndən başqa İlah olmadığına şəhadət edirəm, səndən məğfirət istəyir və sənə tövbə edirəm (Darimi 2/283).

**MUSTAFA YIĞIT**
**1996 KAYSERİ**

---

[18] Muqallid – təqlid edənlərə verilən ad - **(K.H).**

# MÜQƏDDİMƏ

Həmd yalnız Allaha məxsusdur. Ona həmd edir, Ondan yardım və məğfirət diləyirik. Nəfslərimizin şərindən və pis əməllərmizdən Ona sığınırıq. Allah kimi hidayətə yönəltmişsə, onu heç kəs azdıra bilməz, kimi də azdırmışsa, heç kəs onu hidayətə yönəldə bilməz. Allahdan başqa ilah olmadığına şəhadət edirəm. O, təkdir və şəriki də yoxdur. Şəhadət edirəm ki, Məhəmməd Onun qulu və Rəsuludur.

Fərz namazını qəsdən tərk etməyin kəbairdən (böyük günahlardan-**(K.H)**) olduğu, müsəlmanların ixtilaf etmədikləri bir məsələdir. Onun günahı adam öldürmək, zina etmək, oğurluq etmək və içki içmək kimi günahlardan daha böyükdür. Namazı tərk edən özünü Allahın əzabına sövq etmiş, dünya və axirət rüsvayçılığını qəbul etmiş olur. Qurani Kərimdə namazın qədrini ucaldan və onu tərk edənin və ya ona səhlənkarlıqla yanaşanın günahını bəyan edən bir çox ayələr nazil olmuşdur. Məsələn: Alah – *subhənəhu və təalə* – buyurur: **«Onlardan sonra namazı tərk edib şəhvətə uyan bir nəsil gəldi. Biz onları** (Cəhənnəmdəki) **Ğəyy dərəsinə atacağıq»** (Məryəm 59). **«Vay halına o, namaz qılanların ki, onlar öz namazlarından qafildirlər** (səhlənkarlıq üzündən namazlarını vaxtlı-vaxtında qılmazlar). **Onlar** (namazlarında) **riyakarlıq edər»** (əl-Maun 4-7). **«Sizi Cəhənnəmə salan nədir?» Onlar deyəcəklər: «Biz namaz qılanlardan deyildirk, yoxsula da yedirtmədik, batilə dalanlarla birlikdə biz də dalardıq, haqq-hesab gününü yalan saydıq».** (əl-Muddəssir 42-46). Qurani Kərimdə buna bənzər ayələr olduqca çoxdur. Bu mövzuda Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən bir çox hədisi şərif də rəvayət olunmuşdur. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bu hədislərdə namazı tərk edənin və ona etinasız yanaşanların sahib olacağı günahı xəbər verməkdədir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurur: «Şübhəsiz ki, namazı tərk etmək kişi ilə küfr arasındadır»[19]. Digər bir hədisdə: «Bizimlə onlar arasındakı əhd namazdır. Kim bu namazı tərk edərsə küfrə girər»[20]. Başqa bir hədisdə: «Kim namazı qəsdən tərk edərsə, Allahın himayəsindən uzaq düşmüş olar»[21].

# NAMAZI TƏRK EDƏN HAQQINDA ALİMLƏRİN İXTİLAFI

Zikr edilən bu Quran və Nəbəvi naslar qarşısında alimlər, namazı qəsdən tərk edən kimsəni təkfir etmə xüsusunda ixtilaf etmişdilər. İmam Bəğavi – *rahmətullahi aleyhi* –: «Şərhi Sünnə» isimli əsərində: «Fərz namazını qəsdən tərk edən kimsənin təkfirində elm əhli ixtilaf etmişdilər…» demişdir. Sonra da ixtilaf edən alimlərdən bir qrupunun adını zikr etməkdədir[22].

---

[19] Müslim 82,134.

[20] Əhməd 5/346,Tirmizi 2621, İbn Məcə 1079 və s. Bureydədən rəvayət etmişlər. Şeyx əl-Albani İbn Əbi Şeybənin «əl-İman» isimli kitabına etdiyi təhqiqdə s.15 bu hədisin sənədi Müslimin şərtlərinə uyğun olaraq səhihdir demişdir.

[21] Buxari «Əbəbul Mufrad» 18, İbn Məcə 4034 və s. rəvayət etmişlər. Bu hədisin sənədində zəiflik vardır. Lakin bu hədisin bir şahidi də vardır ki, bu hədisi qüvvətləndirməkdədir. Bax: «Təlxisul Xabir» 2/148, əl-Albani «İrvaul Ğalil» 7/8991.

[22] İmam Bəğavi «Şərhus Sunnəh» 2/178-179.

# İMAM ŞƏUKANİ – *RAHMƏTULLAHİ ALEYHİ* – nin MƏSƏLƏ İLƏ BAĞLI İZAHI

İmam Şəukani – *rahmətullahi aleyhi* –: «Neylul Əvtar» kitabında bir az öncə keçən Cabir -*radiyallahu anhu*– nun hədisini izah edərkən belə demişdir: «Bu hədis namazı tərk edən kimsənin əleyhinə küfrü vacib edən dəlillərdən biridir. Müsəlmanlar arasında namazın fərziyyətini inkar edərək onu tərk edən kimsənin küfründə ixtilaf yoxdur. Lakin İslama yenicə girən bir kimsə və ya namazın fərziyyəti ona (tam şəkildə-**(K.H)**) təbliğ olunacaq qədər müsəlmanlarla oturub durmayan kimsələr bundan müstəsnadır. Lakin namazı tərk edən, onun fərziyyətini iqrar etməklə bərabər tənbəllikdən qılmayan – hansı ki, insanların bir çoxlarının halı belədir; alimlər bu xüsusda ixtilaf etmişdilər…». Sonra İmam Şəukani – *rahmətullahi aleyhi* – ixtilafdan bu şəkildə bəhs edir: «Bu xüsusda Sələf və Xələf, cumhurun məşhurlarının - Məlik, Şafii, Əbu Hənifə kimilərinin – görüşləri belədir: «Tənbəllik səbəbi ilə namazı tərk edən kimsə təkfir olunmaz. Əksinə o, kimsə fasiq hesab olunur. Tövbə edib namazı qılarsa nə gözəl, əksi təqdirdə biz ona evli olub zina edən kimsə kimi hökm verib onu öldürərik…»[23].

# İBN HİBBAN – *RAHMƏTULLAHİ ALEYHİ* – nin MƏSƏLƏ İLƏ BAĞLI İZAHI

İbn Hibban – *rahmətullahi aleyhi* –: «Səhih» əsərində Mustafa – *sallallahu aleyhi və səlləm* – in küfr kəlməsini namazı tərk edənə mütləq mənada istifadə etmişdir. Çünki namazı tərk etmək küfrə girməyin başlanğıcıdır. Bir kimsə namazı tərk edər və onda israr edərsə namazsızlığa alışar və bu hal onu digər fərzləri də tərk etməsinə gətirib çıxardar. Bu halda olan bir kimsə fərzlərin tərk olunmasına alışar və bu hal da onu fərzləri inkar etməsinə gətirib çıxardar. Beləliklə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – küfrün növlərinin sonuncusu olan ən son kəliməni onun növlərinin birincisinə mütləq olaraq istifadə etmişdir. İbn Hibban sözünə davam edərək deyir: «Söylədiyimiz şeyin doğruluğuna dəlil olan xəbərin zikri» deyə açdığı babda Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in: «Quranla mübahisə etmək küfrdür»[24] sözünü rəvayət edərək belə deyir: «Ərəblər nəticə etibarı ilə meydana gələcək bir şeyin ismini o, şey meydana gəlməmişdən öncə söyləyirlər. Bu səbəblə bir kimsə Quran haqqında mübahisə etsə, bu hərəkət onu Allah qorusun Quranın mütəşabih[25] ayələri barədə şəkk-şübhəyə gətirib çıxardar. Buna görə də Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in inkar mənasına gələn küfr kəliməsinin ona səbəb olacaq başlanğıc feli mübahisə haqqında ümumiləşdirmişdir»[26].

---

[23] İmam Şəukani «Neylul Əvtar» 1/369.
[24] Əbu Davud 4603, Əhməd 2/528, İbn Əbi Şeybə, Həkim 2/223 və başqaları həsən bir sənədlə rəvayət etmişlər. Bax: əl-Albani «Mişkətul Məsabih təhqiqi» 336, «Səhihut Tərğib» 139.
[25] Mütəşabih – mənaca bir-birinə oxşar, lakin məğzi bəlli olmayan ayələr - **(K.H).**
[26] İbn Hibban «əl-İhsan» 4/324.

# BU MƏSƏLƏDƏ ELM ƏHLİNƏ YARAŞAN İFADƏ

Namazı tərk etmək böyük bir hadisə və çox təhlükəli bir işdir. Namazı tərk etmək bir kimsəni – **MAAZALLAH**[27] - dindən çıxararaq kafir və müşriklərin sırasına daxil edə bilər. Bu mühüm məsələdə alimlər ixtilaf etmişdilər. Elm tələbəsinə lazım olan bu məsələdə təmkinli hərəkət etmək və hər namazı tərk edənə şiddətli və qəti olaraq kafir və ya mürtəd hökmünü dərhal verməməkdir.

# TƏKFİR MƏSƏLƏSİNİN TƏHLÜKƏSİ

Bir müsəlman özü kimi Allaha və axirət gününə iman edən digər bir müsəlman əleyhinə əlində günəş qədər açıq-aydın dəlil olmadan İslamdan çıxıb küfrə girdi deyə hökm verməsi doğru deyildir. Çünki səhabədən bir çoxunun yolu ilə rəvayət edilən səhih bir hədisdə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* –: «Hər hansı bir kimsə qardaşına: «Ey kafir! Deyə müraciət etsə, heç şübhəsiz ki, onların iksindən biri bu küfr kəliməsini qazanmış olar»[28]. Bu hədis başqa bir rəvayətdə: «…Heç şübhəsiz ki, iksindən biri küfrə girmişdir»[29]. Bu və buna bənzər mənada gələn digər hədislər müsəlmana digər başqa bir müsəlmanı təkfir etməkdə tələsməməsini əmr edən ən böyük maneə və nəsihətçidir. Allah – *subhənəhu və təalə* – isə buyurur: **«…Lakin qəlbi küfrə razı olanlara** (qəlbində könüllü surətdə küfrə yer verənlərə) **Allahın qəzəbi tutar və onlar şiddətli bir əzaba düçar olarlar».** (ən-Nəhl 106). Beləliklə bir kimsəni təkfir etmək üçün, onun küfrə qəlbi ilə razı olması, qəlbinin onunla sevinməsi və nəfsinin küfrlə rahat olub sakit olması lazımdır[30]. Bəzi müəllim və tələbələrin dini səy və ruh yüksəkliyi (şövqi-**(K.H)**), inkar və ya təmbəlliyə əhəmiyyət (fikir) vermədən hər namazı tərk edənə kafir hökmünü verməyə sövq edə bilər. Onların zənn etdiklərinə görə bu böyük əməli tərk etməmək üçün qorxutmağa həvəs göstərirlər. Fikirlərinə görə İslamın bu böyük rükununda etinasızlığa səbəb ola bilər deyə, qorxutmaqla namaz və onun hökmündə hər hansı bir səhlənkarlığı dəf etməyə səy göstərirlər (çalışırlar-**(K.H)**). Bu müəllim və tələbəlrdən bəziləri zikr olunan əməllərinə Quran və Sünnədən dəlil gətirirlər. Biz bunların bir qismini zikr etdik. Lakin onlar bu məsələ ilə bağlı küfrü isbat edən və küfrü yox edən dəlillərin arasını cəm etmirlər. Bunu bəzən cəm məsələsindəki qüsurlarından, bəzən də başqa səbəblərə görə edirlər.

Bu müqəddimədə mən ustadımız əl-Albani – *rahmətullahi aleyhi* – nin yazılarına əlavə olaraq bu məsələdə ixtilaf edənlərin dəlillərini bir-bir zikr edərək ixtilafın idrak (başa düşülən-**(K.H)**) yerlərini araşdırıb oralara nəzər salan deyiləm, bunun yeri bu müqəddimə deyildir. Lakin mən burada bəzi din tələbələrinin diqqətindən yayına bilən mühüm və elmi bir neçə xüsusiyyətə diqqət yetirməklə kifayətlənəcəyəm.

---

[27] Allah qorusun - **(K.H).**

[28] Bu İmam Şəukaninin «əs-Seylul Cərrad» 4/578 isimli kitabından götrülmüşdür.

[29] Buxari 6104, Müslim 60,111.

[30] Bura qədər olan ifadələr İmam Şəukanidən idi.

# ALİMLƏRİN GÖRÜŞLƏRİNDƏN İSTİFADƏ EDİLƏN FAYDALAR

İmam Əhməd – *rahmətullahi aleyhi* –, tələbəsi Hafiz Musəddəd b. Musərhəd vasitəsilə belə demişdir: «Allaha şirk qoşmağın və ya Allahın fərzlərindən bir fərzi inkar edərək rədd etməkdən başqa bir kimsəni İslamdan heç bir şey çıxarmaz. Bir kimsə fərzi tənbəlliklə tərk edərsə o, Allahın istəyi altındadır. İstərsə ona əzab verər, istərsə də onu bağışlayar»[31].

Mən də deyirəm ki, İmamın bu ifadəsi, hökmün ümumiliyi və namazın tərk edilməsi məsələsinin xüsusiliyi ilə bağlı Kitab və Sünnətdə bizə gələn hökmün açıq-aydınıdır. Allah – *subhənəhu və təalə* – isə buyurur: **«Allah ona şərik qoşmağı bağışlamaz. Bundan başqa olan günahları isə istədiyi şəxsə bağışlayar»** (ən-Nisa 116). Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən rəvayət edilən: «Allah – *subhənəhu və təalə* – qullarına beş vaxt namaz fərz qılmışdır. Kim bu namazları səhlənkarlıq etmədən və qəsdən heç bir vaxtı tərk etmədən haqqı ilə yerinə yetirərsə, Allah onu Cənnətinə daxil edəcəyinə dair söz vermişdir. Kim də bu beş vaxt namazı qılmazsa Allahın ona heç bir sözü yoxdur. İstərsə onu Cənnətə daxil edər, istərsə də əzab verər»[32].

**İKİNCİSİ:** Muhəmməd b. AbdulVəhhab – *rahmətullahi aleyhi* –: «əd-Durərus Səniyyə» 1/70 isimli kitabında bir kimsə hansı günahdan ötrü təkfir edilir və hansı günahdan ötrü onunla savaşılır deyə soruşan bir kimsəyə verdiyi cavabında belə demişdir: «İslamın rükunları beşdir. Bunların ilki şəhadət kəliməsidir. Sonra digər rükunlar gəlir. Bu rükunları bir kimsə iqrar etdiyi halda tənbəllik səbəbi ilə tərk edərsə biz o, kimsə ilə o, rükunu tərk etdiyindən ötrü savaşsaq da onu öldürsək də əsla təkfir etmərik. Fərziyyətini inkarsız tənbəllik səbəbi ilə bir rükunu tərk edənin küfründə alimlər ixtilaf etmişlər. Bütün alimlərin, küfründə icma etdikləri şeyi biz də təkfir edərik. O, da şəhadət kəliməsidir».

**ÜÇÜNCÜSÜ:** Namazı tərk edənin təkfirində Qurandan bir ayəni dəlil gətirən bəzi müəllimlər o, ayəni insanları təkfir edərkən dəlillərinin əsası etmişlər. O, da: **«Əgər tövbə etsələr, namaz qılıb, zəkat versələr onlar sizin din qardaşlarınızdır. Biz ayələrmizi anlayıb bilən bir tayfa üçün belə ətraflı izah edirik»** (ət-Tövbə 11). Bu ayəni dəlil gətirərkən belə deyirlər: «Allah bizimlə müşriklər arasında qardaşlığın sabitliyini onların namaz qılma şərtinə bağlamışdır. Kim namaz qılmazsa o, dində qardaşımız sayılmaz». Belə bir dəlilə iki tərəfdən cavab verilir: «İmam İbn Atiyyə – *rahmətullahi aleyhi* –: «əl-Muharrəri Vəciz» 8/139-da belə demişdir: «Ayədə olan əgər tövbə edərlər; yəni əgər hallarından dönərlərsə[33] Onların tövbəsi imanı əhatə edən bir tövbədir. Namazı qılmaq isə imanı əhatə edən bir tövbədən sonrakı şərtdir. Allah: «Əgər tövbə edərlər» ifadəsini namaz və zəkatdan əvvəl zikr etmişdir. Bu da dini qardaşlıqla bağlı

---

[31] «Tabuqati Hənəbilə» 1/343, İbn Teyniyyə «əl-İman» 245.

[32] Əbu Davud 1420, Nəsəi 460, Məlik 1/123/14, əl-Albani «Səhihut Tərğib» 363, İbn Əbdul Bərr «Təmhid» 23/289-301.

[33] Yəni Allaha şərik qoşmağa tövbə edib, şəhadət kəlməsini dedikdən sonra müşriklikdən dönərlərsə - **(K.H).**

hökm verməkdə əsas qaydanın ayədəki tərtib olduğuna dəlalət edir. Bu qaydaya görə Təbəri – *rahmətullahi aleyhi* : «Cəmiul Bəyan» 18/86 isimli təfsirində belə deyir: «Allah – *subhənəhu və təalə* – buyurur: **«Ey möminlər! Sizə öldürülmələrini əmr etdiyim o, müşriklər əgər küfr və Allaha şərik qoşmalarından Allaha və Rəsuluna imana dönərlərsə, Rəsuluma itaətlə təslim olur, fərz namazları qılar və onun haqlarını yerinə yetirərlərsə, fərz olan zəkatı əhlinə verərlərsə Allahın əmr etdiyi kimi onlar sizin din qardaşlarınızdır. O, din də İslam dinidir»** Bu ayədə Allah namaz ilə zəkatı birləşdirmişdir. Bir kimsə tövbə etsə, namaz qılsa lakin zəkatı verməkdən imtina edərsə müsəlmanların lehinə və əleyhinə olan hökmlər onun üzərinə də şamil edilib din qardaşımız sayılmazmı? Əgər o: «Bəli o, din qardaşımızdır!» deyərsə, onda biz də belə deyərik: «Ayədə namaz və zəkat, tövbədən dərhal sonra bir yerdə (bərabər) tərtib ilə zikr edilmişdir. Bəs onda onları bir-birindən ayırmağın dəlili nədir!?»[34]. Əgər: «O, din qardaşımız deyildir» deyərsə, onda biz də belə deyərik: «Şübhəsiz bu söz, haqqında heç bir dəlil olmayan batil bir sözdür.

## İBN HUZEYFƏ *-RADİYALLAHU ANHU-* nun HƏDİSİ İLƏ BAĞLI BİR NEÇƏ SÖZ

**DÖRDÜNCÜSÜ:** Huzeyfə b. Yəmən - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər– *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günü İslam paltarın naxışları köhnələrək silinib yox olduğu kimi silinib yox olacaqdır. Belə ki, (yer üzündə) nə orucun, nə namazın, nə həccin, nə də zəkatın nə olduğu bilinməyəcəkdir. Allah bir gecədə Quranı qaldıracaq və yer üzündə ondan bir ayə də belə qalmayacaqdır. O, zaman insanlardan yaşlılar və böyüklər qalacaqlar və deyəcəklər: «Biz babalarımızın bu kəlməni: «Lə iləhə illəllah» - söylədiklərini eşitdik. Buna görə də biz də onu söyləyirik»[35]. Bu hədisi İbn Məcə, Həkim, Əbu Muaviyə, Əbu Məlik əl-Əşcəi, Ribuyy b. Hiraş, Huzeyfə b. Yəmən yolu ilə mərfu[36] olaraq rəvayət edilmişdir. Həkim bu hədisi səhihləmiş, İmam Zəhəbi də Həkimin səhihləməsinə razılıq göstərmişdir. əl-Busuri «Misbahus Zucac» isimli kitabında zikr olunan hədisi səhihləmiş, İbn Həcər də Buxarinin şərhində 13/16-da bu görüşün doğruluğunu sübut etmişdir. Bəzi kimsələr hədisi Əbu Muaviyə haqqında varid olan zərərsiz bir neçə sözdən ötrü hədisi illətli (yəni: nöqsanlı-**(K.H)**) qəbul edərək hədisi zəif saymışlar. Lakin onlara qüvvətli bir sıralanma gizli qalmışdır. Bu hədisi eyni mətn və eyni sənədlə Əbu Muaviyə yerinə Əbu Əvana rəvayət etmişdir. əl-Busuri «Misbahus Zucac» 3/254-də belə demişdir. Əbu

---

[34] Müxaliflər qeyd edirlər ki, bir kimsənin din qardaşı sayılması üçün bu ayədə gələn: **«Əgər tövbə etsələr, namaz qılıb, zəkat versələr»** üç əməlin üçüdə şərtdir. Təbərani – *rahmətullahi aleyhi* – də onu qeyd edir ki, əgər bir kimsə zəkatı etiqadla deyil sadəcə verməməkdə iqrar edərsə o, kimsə bizim din qardaşımız sayılmazmı? - **(K.H).**

[35] İbn Məcə 4049, Həkim 4/473 – **(M.Y).** Həkim 8460,8646, İbn Həcər «Fəthul Bəri» 13/16, əl-Albani «Səhih Hədislər Silsiləsi» 87, Səhih Cəmius Səği» 8077 - **(K.H).**

[36] **MƏRFU HƏDİS -** Bu o, hədisdir ki, hansısa bir əməlin, sözün və ya sifətin Peyğəmbər – *sallallahu aleyhi vəs səlləm* –ə çatması mərfu hədis adlanır. 1. əl-Mərfu əl-Qövli - Peyğəmbər – *sallallahu aleyhi vəs səlləm* – in dediyi söz. 2. əl-Mərfu əl-Feli - Peyğəmbər – *sallallahu aleyhi vəs səlləm* – in etdiyi əməl. 3. əl-Mərfu əl-Təqriru - Peyğəmbər – *sallallahu aleyhi vəs səlləm* –in görüb qadağan etmədiyi (hər hansısa bir əməl, və ya söz). 4. əl-Mərfu əl-Vəsfiyu - Peyğəmbər – *sallallahu aleyhi vəs səlləm* – in ən gözəl əxlaqlı olması - **(K.H).**

Əvana isə hər kəsin ittifaq etdiyi güvənilir (siqa-etibarlı-**(K.H)**) və razı olunan bir ravidir.

Ustadımız əl-Albani – *rahmətullahi aleyhi* – dəyərli kitabı: «Səhih Hədislər Silsiləsi» 1/130-132-də zikr olunan hədisin açıqlamasında belə demişdir: «Bu hədisdə çox önəmli fiqhi faydalar vardır. O, da «Lə İləhə İlləllah» kəlməsi, sahibini namaz və İslamın digər rükunlarından bir rükunu yerinə yetirməsə də belə o, kimsə Qiyamət günü Cəhənnəm atəşində əbədi qalmaqdan qutulacaqdır.

Alimlər fərziyətinə imanla bərabər namazı tərk edən kimsə haqqında ixtilaf etmişlər. Alimlərin cumhuruna görə namazı tərk etməklə təkfir olunmaz əksinə o, kimsə fasiqdir. Əhməd b. Hənbəl – *rahmətullahi aleyhi* – zikr olunduğuna görə namazı tərk edən təkfir olunur, hədlə deyil mürtəd olaraq öldürülür görüşündə idi[37]. Səhabədən: «Onlar namazı tərk etməkdən başqa heç bir əməli tərk etməyi küfr olaraq görməzdilər…»[38] rəvayəti səhihdir. Bunu Tirmizi və Hakim rəvayət etmişdilər.

Bu məsələdə mən cumhurun görüşünü doğru hesab edirəm. Səhabədən nəql edilən sözlərdəki küfrlə sahibini Cəhənnəmdə əbədi qalmağa aparan küfrü qəsd etdiklərinə nə qəti bir hökm, nə də Allahın onları bağışlamayacağına bir ehtimal vardır. Necə deyərlər? Huzeyfə b. Yəmən - *radıyallahu anhu* – səhabələr içərisində özünə məxsus fəziləti ilə seçilmiş səhabələrdən biri idi. Bu məsələni təqribən Əhməd b. Hənbəl kimi başa düşən Sıla b. Zufər: «Onlar namaz və s. şeyləri bilmədikləri halda «Lə İləhə İlləllah» demələri onlara nə fayda verir» demiş və bu kəliməni bir neçə dəfə təkrar etmişdir. Hər dəfə də Huzeyfə b. Yəmən - *radıyallahu anhu* – Sılaya cavab verməmək istəməmişsə də sonda: «Ey Sıla! Bu sözlər onları Cəhənnəmdən qurtaracaqdır» demiş və sözlərini üç dəfə təkrar etmişdir»[39]. Bu ifadə Huzeyfənin namazı tərk edənin - digər rükunlar da belədir - kafir olmadığına, əksinə onun müsəlman olub Qiyamət günü Cəhənnəm odunda əbədi qalmaqdan qurtulacağına qəti dəlildir. Bu qaydanı yaxşıca əzbərlə çünki bunu başqa bir yerdə tapmaya bilərsən.

Sonra mən Hafiz Sahavinin «Hədislə əlaqədar fətvalar» 2/84 kitabını mütaliə etdim. Kitabda Sahavi namazı tərk edənin küfrü ilə əlaqədar məlum bəzi hədisləri zikr etdikdən sonra belə demişdir: «…Lakin bu hədislərin hər birinin zahirindən məlum olan müsəlmanların arasında yetişmiş olmaqla bərabər namazın fərziyətini inkar edərək onu tərk edən kimsəyə şamil olunmalıdır. Belə bir kimsə müsəlmanların icması ilə kafir və mürtəddir. Həmin şəxs tövbə edib İslama dönərsə qəbul olunur, əksi təqdirdə öldürülür. Lakin fərziyyətinə etiqad edərək üzürsüz təməbəllikdən namazı tərk edən kimsə haqqında cumhurun qəti və səhih naslarına görə belə bir kimsə küfrə girməz. Səhih olan görüşə görə bir kimsə namazı vaxtından gec qılarsa – yəni zöhr namazını günəş batana qədər tərk edərsə və ya məğrib namazını günəş çıxana qədər tərk edib qılmazsa – o, kimsə dindən çıxan bir kimsə kimi tövbəyə dəvət edilir. Əgər tövbə etməzsə öldürülür. Ölüsü yuyulur, cənazə namazı qılınır və müsəlmanların qəbristan-

---

[37] Əhməd b. Hənbəlin bu məsələdəki səhih görüşünü yaxşı başa düşmək üçün bu risalənin 32-39-cu səhifələrinə bax – **(M.Y).**

[38] Tirmizi 2622, əl-Albani «Səhihut Tərğib» 1/299,562.

[39] 31-ci sətraltı qeydə bax.

lığında basdırılır. Müsəlmanlar üçün qəbul olunan bütün hökmlər onun üçün də qəbul olunur. Namazı tərk edən kimsəyə küfr kəlməsini aid etmək, onun kafirlə bəzi hökmlərdə şərik olmasındandır şəklində təfsir edilir.

# DƏLİLLƏRİN ARASINI CƏM ETMƏK

Namazı tərk etmək ilə əlaqədar zikr olunan nasları Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən rəvayət edilən: «Allah – *subhənəhu və təalə* – qullarına beş vaxt namaz fərz qılmışdır… Allah istərsə onu Cənnətə daxil edər, istərsə də əzab verər»[40]. «Hər kim Allahdan başqa ilah olmadığını bilərək ölərsə Cənnətə girər»[41] və s. (bu mövzu ilə bağlı) hədislərin arasını cəm etmək lazımdır. Hədislərlə əməl etməyin yolu da budur. Buna görə də müsəlmanlar tarix boyunca namazı tərk edənə mirasçı olmağa və onu da mirasçı etməyə davam etmişlər.

**BEŞİNCİ:** Allah – *subhənəhu və təalə* – isə buyurur: **«Allah ona şərik qoşmağı bağışlamaz. Bundan başqa olan günahları isə istədiyi şəxsə bağışlayar»** (ən-Nisa 116) ayəsindən də məlum olduğu kimi namazı tərk etmək şirk deyildir. Beləliklə namazı tərk edən bəzi kimsələrin, Allahın məğfirəti və Rəhmətinin altına girəcəyini ifadə edən «**BİTAKA VƏRƏQƏ**» hədisi[42] və «**ŞƏFAƏT**» hədisi[43] və

---

[40] Əbu Davud 1420, Nəsəi 460, Məlik 1/123/14, əl-Albani «Səhihut Tərğib» 363, İbn Əbdul Bərr «Təmhid» 23/289-301.

[41] Müslim 23,43 – Osman – *radıyallahu anhu* – dan rəvayət edilmişdir.

[42] Rəsulullah - *səllallahu aleyhi və səlləm* – buyurur: «Qiyamət günü mənim ümmətimdən bir nəfəri bütün insanların qarşısında çağıracaqlar. Onun qarşısına günahlarla dolu doxsan doqquz kitab qoyulacaq. Hər birinin uzunluğu gözün son görmə həddi qədər olacaqdır». Sonra ondan soruşacaqlar. «Sən bunlardan hansınısa birini inkar edirsənmi? Əməlləri yazan mələklər sənə zülm etdilərmi?». Qul: «Yox, Ya Rəbbim!» deyəcəkdir. Allah buyuracaq: «Səndə bunlara qarşı bir yaxşı əməl varmı?». Həmən şəxs qorxudan özünü itirərək: «Yox, Ya Rəbbim!» deyəcəkdir. Ona deyiləcək: «Bizdə sənin bir yaxşı əməlin vardır. Bu əməlinə görə bu gün sənə əsla zülm olunmayacaqdır». Onun qarşısına «Allahdan başqa ilah olmadığına və Məhəmmədin Allahın qulu və Rəsulu olduğuna şəhadət edirəm» kəlməsi yazılmış vərəqə çıxarılacaqdır. Həmən qul deyəcəkdir: «Ya Rəbbim! Bu vərəq bu qədər günahların qarşısında nə gücə malikdir». Allah: «Bu gün sənə əsla zülm olunmayacaqdır». Günahları tərəzinin bir gözünə, həmən vərəqi isə tərəzinin o biri gözünə qoyacaqlar. Vərəqə olan tərəzi ağır gələcəkdir. Rəhman və Rəhim olan Allahın adı qarşısında heç bir şey ağır gəlməz». Tirmizi 2639-2641, İbn Məcə 4300, Əhməd 2,4/213, əl-Həkim 1/5-6,213,529 əl-Albani «Səhih Hədislər Silsiləsi» 135, «Səhihul Cəmi» 1776.

[43] Məbəd b. Xəlil əl-Ənəzi dedi: «Sabit şəfaət hədisini eşitməkdən ötrü Ənəs b. Məlikin yanına getdik. Duha namazını qılan vaxtı onun yanına çatdıq. Sabit bizim üçün izn istədi. Yanına girdik!». Sabit ona: «Ey Əbu Həmzə! Bəsrə əhalisindən olan bu qardaşların səndən şəfaət hədisini eşitmək üçün gəliblər!» dedi. Ənəs – *radıyallahu anhu* – rəvayət etdi ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günü insanlar çaşqın düşəcəklər. Nəhayət Adəm – *əleyhissəlam* – ın yanına gəlib: «Zurriyətinə şəfaət et!» deyəcək-lər. Adəm: «Mən buna layiq deyiləm, lakin sizlər İbrahim – *əleyhissəlam* – ın yanına gedin. Çünki o, Xəlilullahdır!» deyəcəkdir. İnsanlar İbrahim – *əleyhissəlam* – ın yanına gələcəklər. O, da: «Mən buna layiq deyiləm, lakin sizlər Musa – *əleyhissəlam* – ın yanına gedin. Çünki o, Kəlimullahdır!» deyəcəkdir. İnsanlar Musa – *əleyhissəlam* – ın yanına gələcəklər. O, da: «Mən buna layiq deyiləm, lakin sizlər İsa – *əleyhissəlam* – ın yanına gedin. Çünki o, Allahdan gəlmə ruh və Ondan olan sözdür!» deyəcəkdir. İnsanlar İsa – *əleyhissəlam* – ın yanına gələcəklər. O, da: «Mən buna layiq deyiləm, lakin sizlər Məhəmməd - *sallallahu aleyhi və səlləm* – in yanına gedin!» deyəcəkdir. Nəhayət insanlar mənim yanıma gələcəklər. O, da: «Mən bunun üçün yaradıldım!» deyəcək və Allahın hüzuruna izn istəmək üçün gedəcəyəm. «Mənə izn verilir, hüzurunda dikilərək və Allaha həmd-səna etdikdən sonra səcdə edərək yerə qapanıram!». Mənə: «Ya Məhəmməd! Başını qaldır, söylə! Sözün dinlənilir! İstə, sənə verilir! Şəfaət et, şəfaətin qəbul edilir!». Bundan sonra mən: «Ya Rəbbim! Ümmətim, ümmətim!»

eyni mənanın doğruluğunu sübut edən bunlara bənzər hədislərə elm əhlindən bəziləri: «Bu hədislər ümumi mənalı hədislərdir. Namazın tərk etməsi ilə bağlı hədislər isə xüsusi mənalı hədislərdir» deyə cavab verməyə çalışmışlar.

## ƏHLİ SÜNNƏTİN Əl-VAD VƏ Əl-VAİD QAYDASI

Mən də deyirəm ki, bu kimi kimsələr – Allah onlara kömək olsun – bu görüşlərini tərsinə çevirsələr, namazı tərk edən haqqında gələn hədislərin ümumi mənalı, şəfaətlə əlaqədar olan hədislərin xüsusi olduğunu söyləsələr sözləri daha doğru olardı. Onların belə etmələri Əhli Sünnədə bilinən «**əl-VAD** və **əl-VAİD**» qaydasına da uyğun gələrdi. Bu qaydanı Şeyxulislam İbn Teymiyyə – *rahmətullahi aleyhi* – də təqrir etmişdir. Bu qaydanı Şeyxulislam kulliyatının 8/484, 11/648 və 23/305-ci cildlərində istifadə etmişdir.

Bu qaydanın xülasəsi belədir: «**Əl-VAİD**» ilə əlaqədar (Cəhənnəm əzabı ilə qorxudan) naslar Allahın diləməsi altındadır. Allah istərsə bağışlayar, istərsə də vaidini yerinə yetirərək əzab verər. Lakin «**Əl-VAD**» (Cənnət və mükafatı vəd edən) naslara gəlincə şübhəsiz ki, Allah vədini yerinə yetirəcəkdir. O, bunu öz üzərinə vacib etmişdir[44]. Buna görə də alimlər bu kəliməni üsul qəbul edib onunla dəlil gətirən kimsələr belə demişlər: «Mən hər nə qədər **VAİD**-də və ya **VAD**-da rast gəlsəm vaidlə əlaqədar sözümdən dönər, vadlə əlaqədar sözümdən isə

---

deyə şəfaət diləyəcəm. Mənə: «Get! Qəlbində bir buğda və ya arpa dənəsi qədər iman olan hər kim varsa onu oradan çıxart!» deyiləcəkdir. Mən dərhal gedib bunu yerinə yetirdikdən sonra yenə Rəbbimə dönüb onu həmd-səna etdikdən sonra səcdə edərək yerə qapanıram!». Mənə: «Ya Məhəmməd! Başını qaldır, söylə! Sözün dinlənilir! İstə, sənə verilir! Şəfaət et, şəfaətin qəbul edilir!». Bundan sonra mən: «Ya Rəbbim! Ümmətim, ümmətim!» deyə şəfaət diləyəcəm. Mənə: «Get! Hər kimin qəlbində bir xardal dənəsi qədər iman varsa onu oradan çıxart!» deyiləcəkdir. Mən dərhal gedib bunu yerinə yetirdikdən sonra yenə Rəbbimə dönüb onu həmd-səna etdikdən sonra səcdə edərək yerə qapanıram!». Mənə: «Ya Məhəmməd! Başını qaldır! Söylə, sözün dinlənilir! İstə, sənə verilir! Şəfaət et, şəfaətin qəbul edilir!». Bundan sonra mən: «Ya Rəbbim! Ümmətim, ümmətim!» deyə şəfaət diləyəcəm. Mənə: «Get! Hər kimin qəlbində bir xardal dənəsi ağırlığından daha az, daha az, daha az iman varsa onu da atəşdən çıxart!» deyiləcəkdir. Mən də dərhal gedib bunu yerinə yetirəcəm.

Bu Ənəs – *radiyallahu anhu* – nun bizə xəbər vermiş olduğu: «Ənəs hədisidir!». Biz onun yanından çıxdıq. Nəhayət səhranın yüksək bir yerinə yetişdiyimiz zaman Həsənul-Bəsrinin yanına çatsaq da, ona salam versək də, o, Əbu Xəlifənin evində gizlənmiş bir halda idi. Onun yanına girdik, salam verdik və: «Ya Əbu Səid! Biz qardaşın Əbu Həmzənin yanından gəlirik. Şəfaət haqqında danışdığı hədisi heç eşitməmişdik». O: «Davam edin, hədisi söyləyin!» dedi. Biz də ona hədisi danışdıq. O, yenə: «Davam edin, söyləyin!» dedi. Biz: «Ənəs bundan başqasını danışmadı!» dedik. O, dedi: «O, bizə bunu iyirmi il bundan qabaq danışmışdı. O, vaxt hafizəsi və qüvvəsi çox gözəl idi. İndi isə bir qism şeyləri unutmuşdur. Şeyx bunu unutdumu, yoxsa sizlərə bunu danışmaq istəmədimi – bilmirəm?!». Biz də: «Sən bizə danış!» dedik. O, güldü və: **«İnsan tələsən-hövsələsiz yaradılmışdır».** (əl-Ənbiya 37) (ayəsini oxudu). Sonra Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – dördüncü dəfə yenə Rəbbinin yanına qayıdacaq. Ona həmd-səna etdikdən sonra səcdə edərək yerə qapanacaq!». Mənə: «Ya Məhəmməd! Başını qaldır! Söylə, sözün dinlənilir! İstə, sənə verilir! Şəfaət et, şəfaətin qəbul edilir!». Bundan sonra mən: «Ya Rəbbim! Mənə izn ver: «Lə İləhə İlləllah» deyən kimsələr haqqında şəfaət edim. Allah – *subhənəhu və təalə* – ona: «Bu sənin üçün deyil (və ya bu sənə aid deyil) deyə buyurdu. Lakin İzzətimə and olsun ki: «Lə İləhə İlləllah» deyən Tövhid əhlinin hamısını Cəhənnəmdən çıxardacağam!» Buxari 7510, Müslim 326.

[44] Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – dən rəvayət edilən bir hədis vardır. Mənası belədir: «Allah kimə bir əməl qarşılığı savab vəd etsə Allah onu şübhəsiz ki, yerinə yetirəcəkdir. Kimə də bir əməl qarşılığında cəza vəd etsə Allah onda ixtiyar sahibidir (yəni istərsə ona cəza verər, istərsə bağışlayar). Əbu Yəla «Musnəd» 3316, İbn Əbu Asim «Sünnə» 960, əl-Albani «Səhih Hədislər Silsiləsi» 2463.

dönmərəm. Çünki bu fəzilətdir. Bu haqda daha geniş məlumat üçün İmam Təhavi – *rahmətullahi aleyhi* – nin əqidə ilə bağlı kitabın şərhinə (318).

**ALTÜNCI:** Bu dəlillərdən sonra bəzi kimsələrin, namazı tərk edənin fisk və fucurunu[45] isbatla bərabər onu küfrə nisbət etməməyin irca[46] görüşü olduğunu deməmələri çox qəribədir. Belələrinin yanında irca görüşü onun həddi və qaydası görəsən nədir?![47]

Bununla bərabər biz namazı tərk edəni müdafiə edib, onu təmizə çıxartmağımız kimi başa düşülməməlidir. Əksinə biz namazı tərk edəni mürcim (günahkar-**(K.H)**), facir (pis insan-**(K.H)**) və s. olduğunu tam açıqlıqla ifadə edirik. Belə birisi Rəbbinə tövbə ilə yönəlməzsə, istiğfar istəyib ondan bağışlanma diləməzsə və ya Allah onu əfv edib doğru yola yönəltməzsə – **MAAZALLAH**[48] – onun küfrə və şirkə düşməsindən, İslamdan uzaqlaşmasından qorxmağını tövsiyə edirik.

# BİR NEÇƏ XƏBƏRDARLIQ

Son olaraq demək istəyirəm ki, bu məsələ çox əhəmiyyətli elmi bir məsələdir. Bu məsələdə elm əhli – Sələf və Xələf – olaraq ixtilfa düşmüşlər. Bu məsələdəki araşdırma saf (təmiz) bir ruh, fitrəti pozulmamış bir əql, doğru görüş, təəssübkeşlikdən uzaq olaraq və təqlidi tərk edərək aparılmalıdır. Çünki bu xislətlər bir kimsəni haqqı bilməyə və insanları onun dəvətinə yaxınlaşdırar.

Şeyx Muhəddis Allamə Muhəmməd Nəsrəddin əl-Albani – *rahmətullahi aleyhi* – nin bu kitabçası bir az öncə keçən ifadələrim üçün gözəl bir nümunədir. Mən bu kitabçanı elmin yayılmasına olan həvəsimdən, savab qazanmaq istəyimdən və ixtilaf anında məsələni Allah və Rəsuluna buraxmaqla bağlı Allahın: **«Əgər bir iş barəsində mübahisə etsəniz, Allaha və Qiyamət gününə inanırsınızsa, onu Allaha və Peyğəmbərinə həvalə edin! Bu daha xeyirli və nəticə etibarı ilə daha yaxşıdır»** (ən-Nisa 59) əmrinə tabe olaraq oxuyucu qardaşlarıma təqdim edirəm. Bu kitabçanı oxuyan qardaşlarımdan heç kimsəni adət ənənələrin yetişdiyi cəmiyyətdə və ya bəzilərinin təlqini, haqqı qəbul edib, ona boyun əyib uğrunda mücadələ etməkdə mane olmamalıdır. Çünki haqq əməllərin ən dəyərlisi və ən əzizidir.

Uca Allahdan müvəffəqiyyət, doğruluq, kamillik, sapmış qullara hidayət, küfr və inadkarlığa (günahlar çirkabına) batmış kimsələrin də ondan qurtulmasını diləyirəm.

Son duamız aləmlərin Rəbbi olan Allaha həmd olsun.

**ƏLİ B. HƏSƏN ƏLİ B. ABDUL HƏMİD**
**ƏL-HƏLƏBİ ƏL-ƏSƏRİ**
**ÇƏRŞƏNBƏ 17 RƏCƏB 1412-Cİ İL HİCRİ.**

[45] Günah və asiliyini - **(K.H).**

[46] Murciyə tayfası əməli imandan çıxartdıqları üçün murciyə deyə adlandırılmışlar. Murciyə sadəcə iqrarın iman olduğunu iddia etmiş və iman: «Allahı iqrar və bilməkdir demişlər. Onlara görə iman artmaz və azalmaz. Ləlәkai «Şərhi Usuli Etiqad» 380 – **(M.Y).**

[47] İbn Teymiyyə «Kitabul İman» 112-113-cü səhifəsinə bax.

[48] Allah qorusun - **(K.H).**

# MÜƏLLİFİN MÜQƏDDİMƏSİ

Həmd yalnız Allaha məxsusdur. Ona həmd edir, Ondan yardım və məğfirət diləyirik. Nəfslərimizin şərindən və pis əməllərmizdən Ona sığınırıq. Allah kimi hidayətə yönəltmişsə, onu heç kəs azdıra bilməz, kimi də azdırmışsa, heç kəs onu hidayətə yönəldə bilməz. Allahdan başqa ilah olmadığına şəhadət edirəm. O, təkdir və şəriki də yoxdur. Şəhadət edirəm ki, Məhəmməd Onun qulu və Rəsuludur.

Bu kitabçanın əsli «Səhih Hədislər Silsiləsi» isimli kitabımın 7-ci cilidindəki Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in hədislərindən biri olan dəyərli bir hədisin[49] təxrici və şərhi ilə meydana gələn lətif və elmi bir araşdırmadır. Bu hədisin əhəmiyyətinin və faydasının çox olmasına əsasən tək zikr etməyi uyğun gördüm. Bunun səbəbi isə bəzi qardaşlarımızın onun tək çap ediliməsinin daha uyğun olacağını və bunun xeyir işdə tələsmək qismində olduğunu təklif etmələridir. Bu təklif düşüncələrimə uyğun gəldiyi üçün bu araşdırmanın bir nüsxəsini tələbəm, gənc dostim Hələbli Əli b. Həsənə nəşr və yaymaq üçün verdim. Bu araşdırmadan gələn faydanın dəyərli oxuyucuların əldə etməsi üçün elmi bir müqəddimə əlavə etməyi də ondan xahiş etdim. O, öz üzərinə düşən məsuluyyəti yerinə yetirdi. Allah ondan razı olsun. Hətta nəşrini və takrak nəzərdən keçrilməsini özü etdi.

Bu qısa müqəddimənin sonunda Uca Allahdan bu əhəmiyyətli elmi araşdırmanı oxuyan və araşdıranlara fayda verməsini diləyirəm. O, hər şeyi eşidən və dualara cavab verəndir.

**MUHƏMMƏD NƏSRƏDDİN ƏL-ALBANİ**

[49] Bu hədis «Səhih Hədislər Silsiləsi» 3054.

# KİTABIN ƏSASINI TƏŞKİL EDƏN HƏDİSİN MƏTNİ

İmam Məğmə b. Rəşid (Abdurrazzaqın «Musənnəf» əsərinə əlavə edilən 11/409-411) «Cami» isimli əsərində Zeyd b. Əsləmdən, o da Ata b. Yəsirdən, o da Əbu Səid əl-Xudri – *radıyallahu anhu* – rəvayət etdi ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurur: «….Nəhayət möminlər atəşdən qurtulduqları zaman, nəfsim əlində olana and olsun ki, möminlərin atəşdə olan qardaşları haqqında Rəbbləri ilə mücadələ etmələri sizdən birinizin dünyada ikən öz haqqı üçün qardaşı ilə mücadələ etməsindən daha şiddətlidir. Onlar: «Ey Rəbbimiz! Bu (cəhənnəmdə) qalan qardaşlarımız bizim ilə bərabər namaz qılır, oruc tutar və həcc edər (və cihad edərdilər!) Lakin onları atəşə saldın» deyirlər. Allah onlara: «Gedin! Tanıdığınız kimsələri oradan çıxarın! Onların üzləri Cəhənnəmə haram edildi!» deyilir. Atəş onlardan kimisinin topuqlarına qədər, kimisinin diz qapaqlarına qədər yandırır. Onlardan bir çoxunu oradan çıxarırlar. Sonra: «Ey Rəbbimiz! Cəhənnəmdə əmr etdiklərindən heç kimsə qalmadı!» deyirlər. Sonra möminlər təkrar geri dönüb yenə də (Allaha müraciət) edərlər. Allah buyurar: «Geri dönün! Qəlbində bir dinar ağırlığında iman və yəqinlik olan hər kimi tanıyırsınızsa onu da oradan çıxarın!». Onlar yenə də bir çoxlarını oradan çıxarırlar. Sonra yenə: «Ey Rəbbimiz! Cəhənnəm içərsində əmr etdiklərindən heç kimsəni buraxmadıq!» deyirlər. Allah buyurur: «Geri dönün! Qəlbində yarım dinar ağırlığında xeyr olan hər kimi tanıyırsınızsa onu da oradan çıxarın!». Onlardan bir çoxunu oradan çıxarırlar. Sonra təkrar: «Ey Rəbbimiz! Cəhənnəmdə əmr etdiklərindən heç kimsəni buraxmadıq!» deyirlər. Allah buyurur: «Geri dönün! Qəlbində zərrə ağırlığında xeyr olan hər kimi tanıyırsınızsa onu oradan çıxarın!». Yenə bir çox insanları oradan çıxarırlar. Sonra təkrar: «Ey Rəbbimiz! Orada xeyr sahibi olan heç bir kimsəni buraxmadıq!» deyirlər. Əbu Səid əl-Xudri – *radıyallahu anhu* – deyir ki, əgər kim bu hədisə inanmırsa bu ayəni oxusun: **«Həqiqətən Allah zərrə qədər zülm etməz. Əgər yaxşı bir əməl baş verərsə onu iki qat artırar və öz tərəfindən də böyük mükafat verər».** (ən-Nisa 40). (Başqa rəvayətdə Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Nəhayət Allahın rəhmətindən olaraq, qulları arasında Cəhənnəm əhlindən dilədiklərini Cəhənnəmdən çıxartmağı əmr edərək mələklərə: «Lə İləhə İlləllah» – deyənlərdən, Allahın mərhəmət buyurduğu kimsələrdən, Allaha heç bir şeyi şərik (ortaq) qoşmamış olanları Cəhənnəmdən çıxarsınlar!» deyə əmr edir. Mələklər: «Onları Cəhənnəmdə səcdə yerlərindən tanıyırlar. Atəş Adəm oğullarının səcdə yeri müstəsna, hər yerini yeyir. Allah səcdə yerinə toxunmağı atəşə haram etmişdir!»-**K.H**). Bundan sonra Allah buyurur: «Mələklər şəfaət etdilər, peyğəmbərlər şəfaət etdilər, möminlər şəfaət etdilər. Şəfaət etməyən bir Ərhamur-Rahimin qaldı. Bundan sonra atəşdən bir camaatı toplayır və dünyada ikən heç bir xeyr işləməyib cəhənnəmdə yanıb kömürə dönmüş bir çox kimsələri çıxarır. Onlar Cənnətin yolları üzərində olan «Həyat Çayı» adı verilən bir çaya salınırlar. Onlar selin gətirdiyi yabanı reyhan toxumları kimi çıxırlar. Görmürsünüz ki, yabanı reyhan bəzən bir daş və ya bir ağac dibində (kölgədə bitdiyi kimi) necə olur. Günəşə doğru olan hissəsi sarı, yaşıl olur.

Kölgədə olan hissəsi isə açıq olur. (Başqa rəvayətdə «Ey Cənnət əhalisi! Bunların üzərinə bol su, Cənnət sularından tökün!» deyiləcəkdir). Boyunlarında qızıl və gümüşdən «Allahın azad etdiyi» kimsələr halqası – başqa rəvayətdə halqaları – olacaqdır. Allah buyurur: «Cənnətə girin! Meyl etdiyiniz və gözünüzün görə bildiyi hər nə varsa və bir o, qədəri də sizindir!» deyilir. Cənnət əhalisi onlar haqqında: «Bunlar Rəhmanın azad etdikləridir. Allah onları heç bir yaxşılıq etməmiş, keçmiş heç bir xeyir əməlləri olmadığı halda Cənnətə saldığı kimsələrdir. Onlar: «Ey Rəbbimiz! Sən aləmlərdə heç kəsə vermədiyin yaxşılığı bizə verdin!» Onlara: «Sizə bundan gözəl bir şey vardır!» Onlar: «Ey Rəbbimiz! Bundan da gözəl?!» Allah buyurur: «Mənim rizam! Artıq bundan sonra sizə əbədiyyən qəzəb etməyəcəyəm!»[50].

# HƏDİSİN TƏXRİCİ[51]

Hədisin sənədi Buxari vəMüslimin şərtlərinə uyğun olaraq səhihdir. Hədis Abdurrazzaqın Mamər yoluyla rəvayət edilmişdir. Hədis eyni zamanda Abdur-Razzaq yolu ilə:

Əhməd «Musnəd» 3/34.

Nəsai «Sünnədə» 5025.

İbn Məcə 60.

İbn Huzeymə «Tövhid» səh 184,201,712.

İbn Nəsir əl-Mərvəzi «Tazimu Kadrus Salah» 276-da rəvayət etmişdir.

Bu hədisin rəvayətdində Abdurrazzaq Məhəmməd b. Sevr, Mamərdən hədisi yoxlamış. Lakin hədisin eyni ləfzini (mətnini-**K.H**) nəql etməmişdir. Fəqət bənzərini yəni Hişam b. Sadın aşağıda gələcək hədisini rəvayət etmişdir. Mamərdən bu hədisi yoxlayaraq bir çoxları rəvayət etmişlər.

**BİRİNCİ:** Səid b. Hilal, Zeyd b. Əsləmdən eyni sənədlə bundan daha tam olaraq rəvayət etmişdir. Hədisin ilk sözləri: «Günəşi və ayı görməkdə çətinlik çəkirsinizmi?…» bu sözlərlə başlamış və hədisi axıra qədər zikr etmişdir.

Buxari səhihində 7439 –Tər: səh 7310.

Müslim 183,302.

İbn Huzeymə «Tövhid» 201.

İbn Hibban «İhsan» 7333-də ravayət etmişdir.

**İKİNCİ:** Hafs b. Meysərə, Zeyd b. Əsləmdən eyni sənədlə rəvayət etmişdir. Təxric edənlər:

Müslim 183,302.

Buxari 4581-də hədisin əvvəlini rəvayət etmiş, axırını isə ravayət etməmişdir.

**ÜÇÜNCÜ:** Hişam b. Sad, Zeyd b. Əsləmdən eyni sənədlə rəvayət etmişdir. Təxric edənlər:

Əbu Avanə səhihdə 1/181-183.

İbn Huzeymə «Tövhid» səh 200.

Həkim «Mustədrək» 4/582,584 səhih demişdir.

---

[50] Müslim 182-183.

[51] Araşdırılması – hədisin səhih və ya zəif olduğunu öyrənmək üçün. - **(K.H).**

Mülim səhihdə 183,303-də rəvayət etmiş lakin eyni ləfzi zikr etməmiş, əksinə hədisin ləfzini Hafs B. Meysərə hədisinin ləfzi üzrə nəql etmişdir. Zeyd b. Əsləmə Süleyman b. Amr b. Ubeyd əl-Utvariyyə Əbu Səid – *radıyallahu anhu* – dan hədisi yoxlamışdır. Süleyman b. Amr Leys oğullarından biridir. Əbu Səid – *radıyallahu anhu* – nun evində onun nəzarəti altında idi. Süleyman b. Amr belə demişdir: «Mən Əbu Səid – *radıyallahu anhu* – nu Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – belə deyərkən eşitdim» deyə buyurduğunu deyir və zikr olunan hədisin bənzərini müxtəsər olaraq zikr edir. Kitabın əvvəlində tam təqdim etdiyimiz hədisdəki üçüncü ziyadə bu rəvayətdəndir. Təxric edənlər:

Əhməd «Musnəd» 3/11-12.

İbnHuzeymə «Tövhid» səh 211.

İbn Əbi Şeybə «Musənnəf» 8/103-76.

İbn Məcə «Sünnən» 4280-da çox müxtəsər olaraq rəvayət etmişdir.

İbn Cərir «Təfsir» 16/85.

Yəhyə b. Səid «Zevaid Zuhd» səh 448/1268.

Həkim «Mustədrək» 4/585. Həkim rəvayətində belə demişdir: «Bu hədisin sənədi Müslimin şərtlərinə uyğun olaraq səhihdir.

İmam Zəhəbi bu hökmün doğruluğunu sübut etmişdir. Fəqət hədis həsən hədisdir. Sənəddə Məhəmməd b. İshaq vardır, lakin o, bu rəvayəti açıq-aydın təhdis (filankəsdən, filankəsdən rəvayət) etmişdir.

## HƏDİSİN FİQHİ İZAHI

Gördüyünüz kimi başqa kitabda buna bənzar bir təxric (araşdırılma-**K.H**) tapmayacağınız şəkildə təxricini etdim. Hədisin Buxari, Müslim, digər səhih, Sünnən və Musnəd sahibi imamları arasında «Muttəfiqun aleyh»[52] olduğunu bəyan etdikdən sonra deyirəm ki: «Bu hədisdə çox böyük faydalar vardır. Məsələn: Əməli Saleh möminlərin namaz qılsalar da belə günahları səbəbi ilə Cəhənnəmə düşən qardaşlarına və imanlarının qüvvətinə görə onlardan daha alt səviyyədə olan digər mömin qardaşlarına şəfaət etmələri; Sonra Allah – *subhənəhu və təalə* – nin möminlərdən Cəhənnəmdə qalanlara ehsan (yaxşılıq-**K.H**) edərək heç bir əməlləri və heç bir xeyirləri olmadığı halda onları Cəhənnəm atəşindən çıxarması zikr olunan hədisin faydalarındandır.

Bəzi kimsələr hədisdəki: «…Allah onları heç bir yaxşılıq etməmiş, keçmiş heç bir xeyir əməlləri olmadığı halda…» ifadəsindən əməllə muvahhid olmayanların da Cəhənnəm atəşindən çıxacaqları fikrinə qapılmışlar. Hafiz b. Həcər – *rahmətullahi aleyhi* – Səhih Buxaridə bu hədisi zikr edərkən bu fikirləri rədd etmişdir: «Bu fikir rədd olunandır. Çünki hədisdə: «…Allah onları heç bir yaxşılıq etməmiş, keçmiş heç bir xeyir əməlləri olmadığı halda…» ifadəsindən məqsəd Kəlimeyi Şəhadəti iqrar etməklə çoxlu əməl etməkdir. Hədisin qalan hissəsi də buna dəlalət edir. «Fəthul Bəri» 13/438.

Mən də deyirəm ki, bu ifadələrin doğruluğunu sübut edən ifadələrdən biri də Ənəs – *radıyallahu anhu* – nun şəfaət haqqında rəvayət etdiyi uzun bir hədisdir. Bu hədisdə: «…Ya Məhəmməd! Başını qaldır! Söylə, sözün dinlənilir! İstə, sənə verilir! Şəfaət et, şəfaətin qəbul edilir!». Bundan sonra mən: «Ya

[52] Buxari və Müslimin üzərində ittifaq etdikləri hədis -**K.H.**

Rəbbim! Mənə izn ver: «Lə İləhə İllətllah» deyən kimsələr haqqında şəfaət edim». Allah – *subhənəhu və təalə* – ona: «İzzətimə, Cəlalıma, Əzəmətimə and olsun ki: «Lə İləhə İllətllah» deyən Tövhid əhlinin (muvahhidlərin) hamısını Cəhənnəmdən çıxardacağam!»[53] buyurur. Bu hədis Buxari və Müslimin ittifaq etdiyi bir hədisdir. Eyni hədisi mən «Ziləlul Cənnə» isimli kitabımdada təxric etdim. Ənəs – *radıyallahu anhu* – dan gələn digər bir hədis isə belədir: «…Allah insanlarla haqq-hesabı bitirdikdən sonra ümmətimdən Cənnətə girməyib (Cənnət ilə Cəhənnəm arasında[54]) qalan kimsələri Cəhənnəm atəşinə daxil edər. Atəş əhli onlara: «Allaha ibadət etməniz, Ona heç bir şeyi şərik qoşmamağınız sizi Cəhənnəm əzabından qurtarmadı» deyirlər. Allah: «İzzətimə and olsun ki, onları Cəhənnəm atəşindən qurtarıb azad edəcəyəm» buyurur. Onlara elçilər göndərir. Qap-qara yanmış olaraq atəşdən çıxırlar. «Həyat adlanan çaya girərlər və orada yenidən canlanırlar»[55].

## ƏBU HƏMZƏYƏ RƏDDİYƏ

Bu hədisi İmam Əhməd və s. hədisçilər səhih bir sənədlə rəvayət etmişdilər. Mən də eyni hədisi «Ziləlul Cənnə»-də № 844-də təxric etdim. Hədisin ismi verilən yerdə 842-843-cü nömrələrdə şahidləri də vardır. Zikr olunan hədisin «Fəthul Bəri»-də 11/464-də başqa şahidləri də vardır. Bu kitabın mövzusunu təşkil edən Əbu Səid hədisindən İbn Əbi Həmzənin, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in: «…Atəş üzlərinə toxunmaz…» və s. mənada zikr edilən: «…Üzləri müstəsnadır…» sözlərindən – müsəlman olub namaz qılmayan bir kimsə atəşdən çıxmaz, çünki onun üçün bir əlamət yoxdur – şəkilində hökm çıxarılması rədd edilmişdir.

Bu səhv fikirə görə Hafiz b. Həcər 11/465-də onu tənqid etmişdir. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in: «…Allah onları heç bir yaxşılıq etməmiş, keçmiş heç bir xeyir əməlləri olmadığı halda…» sözünün ümumi mənası namaz qılmayanın Allahın azad etdikləri arasında Cəhənnəm atəşindən çıxacağına dəlildir. Bu ləfz «Kitabu Tövhid»-də gələn Əbu Səid – *radıyallahu anhu* – nun hədisində zikr edilmişdir. İbn Həcər bu sözləri ilə kitabın mövzusunu təşkil edən Əbu Səid hədisini nəzərdə tutmaqdadır. Bu hədisdə İbn Həcər, İbn Əbi Həmzəyə başqa tərəfdən də rədd və etiraz etməkdədir. O, da belədir: «Allah möminləri namaz qılan, oruc tutan və s. əməlləri edən müsəlman qardaşları üçün birinci dəfə şəfaətçi etdikdə, möminlər qardaşlarını bu əlamətləri ilə tanıyıb onları atəşdən çıxaracaqlar. Allah onları sonrakı cəhdlərində də şəfaətçi etdikdə atəşdən bir qrup kimsələri çıxarırlar. Bu çıxanların içərisində namaz qılmayanların olmadığı açıq-aydındır. Lakin bunlarda imanına görə xeyir vardır və hər kəs imanına görə gec də olsa Cəhənnəm atəşindən çıxarılacaqdır. Bu məna hədisdə həqiqətən də açıq-aydın və – inşəallah – heç kimə də gizli deyildir.

---

[53] Buxari 7510 (Sofu oğlu Tər: 16/7370-7373), Müslim 192,326 əl-Albani «Ziləlul Cənnə» 804-805, Əbu Avanə 1/178-179 - Ənəs b. Məlik – *radıyallahu anhu* – nun bu hədisi 39-ci sətraltı qeyiddə zikr olundu – **(M.Y).**

[54] Buxari 4581, Müslim 183 - **(K.H).**

[55] Bax: Əhməd «Musnəd» 3/144/12471, İbn Xuzeymə «Tövhid» 192-193 əl-Albani «Ziləlul Cənnə» 844.

# MƏSƏLƏNİN ARAŞDIRILMASI VƏ İNCƏLƏNMƏSİ

Bu məsələnin fiqh tərəfdən araşdırılmasına və incələnməsinə gəlincə Əbu Səid hədisi, namazı tərk edən Allahdan başqa ilah olmadığına şəhadət edərək ölərsə o, kimsənin müşriklərlə bərabər atəşdə əbədiyyən qalmayacağına kəsin olaraq dəlildir. Ayrıca belə bir kimsənin Allahın diləməsi altında olduğuna Allahın bu ayəsi çox qüvvətli bir dəlildir: **«Allah ona şərik qoşmağı bağışlamaz. Bundan başqa olan günahları isə istədiyi şəxsə bağışlayar»** (ən-Nisa 116).

İmam Əhməd – *rahmətullahi aleyhi* : «Musnəd» 6\240/26090-da bu barədə Aişə – *radıyallahu anhə* – dən mərfu[56] olaraq bir hədis rəvayət etməkdədir. Hədis belədir: «Allah qatında divan (mühasibə, hesabat dəftəri-**K.H**) üç qisimdir. Allah birinci divanın heç bir şeyini əhəmiyyətli saymaz. İkinci divandan heç bir şeyi tərk etməz. Üçüncü divandan heç bir şeyi bağışlamaz. Heç bir şeyi bağışlamayacağı divana gəlincə, bu Allaha şərik qoşmaqdır. Allah buyurur: **«Allaha şərik qoşan Allah Cənnəti haram edər. Onun düşəcəyi yer Cəhənnəmdir…»[57].** Allahın heç bir şeyini əhəmiyyətli saymadığı divana gəlincə, qul ilə Rəbbi arasında orucu tərk etməsi və ya namazı tərk etməsi kimi özünə zülm etməsidir. Allah istəyərsə onu bağışlayar və ya istəyərsə ondan keçər (ona əzab verər-**K.H**). Allahın heç bir şeyi tərk etmədiyi divana gəlincə, qulların bir-birinə etdikləri zülümlərdir. Bunda mütləq qisas vardır[58]. Bu hədisi Həkim «Mustədrək» 4/576-da rəvayət etmiş və səhihləmişdir.

Bu (hədis-**K.H**) hər nə qədər musəlləm (qəbul olunmayan, zəif-**K.H**) olsada bu hədisə təxricini etdiyimiz zikr olunan «Əbu Səid» hədisi şahidlik etməkdədir. Mən bunu «Tahavi Əqidəsi» isimli kitabının təxricində izah etdim.

# MÜƏLLİFLƏRİN HƏDİS HAQQINDAKI DİQQƏTSİZLİYİ

Ey müsəlman qardaşım! Zikr olunan dəlilləri gördün. Bu mühüm məsələdə – yəni namazı tənbəlliklə tərk edənin təkfir ediləcəyinə və ya təkfir edilməyəcəyinə dair ətraflı kitab yazanlar məni heyrətə gətirirlər. Mütaləə etdiyimə görə bu məsələdə kitab yazan kimsələrin heç biri bu hədisi zikr etməmişlər. Bu hədisi isə gördüyün kimi Buxari, Müslim və s. hədis alimləri rəvayət etməkdədirlər. Hədis lehinə olan kimsələrdə bu hədisi öz kitablarında zikr etməmiş, əleyhinə olanlar da ona heç bir cavab verməmişdilər. Bu məsələdə kitab yazan kimsələrdən İbn Qeyyim – *rahmətullahi aleyhi* – dəyərli kitabı olan «əs-Saləh»-də bu məsələdə ixtilaf edən tərəflərin dəlillərini və onların bir-birlərinə verdikləri cavabları müfəssəl şəkildə qeyd etdikdən sonra təkfirə qarşı çıxanların dəlillərindən olan bu hədisin mənasını çox müxtəsər və onun təkfirə mane olma dəlalətini qapalı bir şəkildə zikr etmişdir. Beləliklə hədisdəki şəfaətin namazı tərk edənə də şamil olunduğunu ifadə edən açıq-aydın dəlaləti üzə çıxmamaqdadır. İbn Qeyyim – *rahmətullahi aleyhi* –zikr olunan kitabda belə deyir: Şəfaət

---

[56] 2-ci sətraltı qeydə bax.
[57] Maidə 72 - **(K.H).**
[58] əl-Albani «Daiful Cəmi» 3022 - **(K.H).**

hədisində Allah: «Lakin İzzətimə and olsun ki: «Lə İləhə İlləllah» deyən kimsələrin hamısını Cəhənnəmdən çıxardacağam!» deyə buyurmuşdur. «…Heç bir xeyir etməyən kimsələr də atəşdən çıxacaq…» ifadəsini hədisə əlavə edir.

Görüldüyü kimi hədisin bu şəkildəki mətni iki dəyişik hədisin bir yerə gətrilərək uydurulmuş halıdır. Hədisin əvvəli Buxari və Müslimin ittifaqla rəvayət etdikləri Ənəs – *radıyallahu anhu* – nun hədisinin son hissəsidir. Biz onu yuxarıda zikr etdik. Hədisin son qismi isə bu kitabın əsil mövzusunu təşkil edən «Əbu Səid» hədisində zikr edilən: «…Bundan sonra atəşdən bir cəmaatı toplayar ki, dünyada ikiən heç bir xeyir işləməyib də Cəhənnəmdə yanıb kömürə dönmüş bir çox kimsələri çıxarır…» qismidir.

## İBN QEYYİM – *RAHMƏTULLAHİ ALEYHİ* – nin TƏNQİDİ

İbn Qeyyim – *rahmətullahi aleyhi* – hədisin mənasını ixtisar etməyə yol verməsi açıq-aydındır. Dəyərli oxuyucu! Əvvəlki səhifələrdə İbn Həcər– *rahmətullahi aleyhi* – nin İbn Əbi Həmzəni tənqid edərkən tənqidinin doğruluğunu sübut edən tamamlayıcı dəlillər zikr etmiş və demişdir: «Möminlərin ikinci və ondan sonrakı şəfaətləri – namaz qılmayanlara və onları – atəşdən çıxarmaq üçündür. Beləliklə hədis də buna qəti bir dəlildir». Bu hədis izahını etməyə çalışdığımız məsələdə qəti bir dəlildir. Bu məsələdə zikr olunan dəlillərə təslim olaraq əqidənin birləşdirdiyi alimlər arasında münaqişənin nəhayət sona çatmasıdır. Eyni əqidənin birləşdirdiyi alimlər arasında bu məsələ ilə bağlı münaqişənin bitməsi lazımdır. Məhəmməd ümmətindən böyük günah işləyən kimsələri təkfir etməmək də onların üzərində yekdilliklə ittifaq etdikləri əqidələrindəndir. Elmə nisbət edilən bəzi kimsələrin – inkar edərək namaz və digər əməlləri tərk edən kafirləri buraxıb – etiqadı sağlam olub vacib olan əməllərdən bəzilərində səhlənkarlıq edən müsəlmanları təkfir etmələri, xüsusi ilə bu zamanda heç də doğru deyildir. Allah buyurur: **«Məgər Biz müsəlmanları kafirlərlə eynimi tutacağıq! Sizə nə olub, necə mühakimə yürüdürsünüz»** (Nun 35-36).

Zikr olunan şeylərin lazımınca açıq-aydın olması üçün İbn Qeyyim – *rahmətullahi aleyhi* – bu hədisi, təkfirə mane olan qurupun sağlam dəlili olaraq zikr etməkdən diqqətsizlik göstərməməsini istərdim. Yanında bu hədisə verəcək bir cavabı var idisə onu da verməli idi. Bu şəkildə hərəkət edildikdə quruplardan heç birinə meyil etmədən hər iki qurupa da insaf edilmiş və araşdırmaya da haqqı verlimiş olurdu. Bununla bərabər (İbn Qeyyim) araşdıran bir kimsənin iki qurupun da dəlillərini səhih olaraq başa düşməsinə yardım edən: «İki qurup arasındakı hökm və onlar arasındakı münaqişənin təfsilatı» deyə xüsusi bir bab açmışdır. Bundan ötrü ona təşəkkür etmək üzərimə vacibdir. Ona təşəkkür edirəm.

## KÜFRÜN ƏMƏLİ VƏ ETİQADI OLARAQ İKİ QİSMƏ AYRILMASI

İbn Qeyyim – *rahmətullahi aleyhi* – zikr olunan babda alimlərin yanında qəbul edilən müsəlmanın düçar olduğu hər küfrün onu İslam millətindən çıxarmayacağı məsələsini çox gözəl izah etmiş və bu məsələyə haqqını vermişdir. Bununla bərabər onun bu kitabındakı məqamını açıqlayan sözlərinin xülasəsini və bəzi şərtləri bu kitabda yerləşdirib, sonra onları – bu səhih hədisə uyğun və

racih (üstün-**(K.H)**) tutulan görüşə uyğün – tənqid etmək istəyirəm. Çünki bunun dəyərli oxucuya faydalı olacağına inanıram. İbn Qeyyim – *rahmətullahi aleyhi* – belə demişdir: «Küfr iki qisimdir. O, da əməli küfr, inkari və etiqadi küfrdür. Əməli küfr: İmana zidd olan və imana zid olmyan qisimlərə ayrılır. Heykəllərə səcdə, Quranı təhqir etmək, Peyğəmbəri söymək – və ya öldürmək – kimi günahlar imana zid etiqadi küfrdür. Allahın nazil etdiyi ilə hökm verməmək, namazı tərk etmək əməli küfrdür».

Mən də deyirəm ki, İbn Qeyyim – *rahmətullahi aleyhi* – nin mütləq olaraq işlədilən bu ifadəsi mübahisəlidir. Bir kimsənin namazı tərk etməsi, onun namaz və namaz qılanı lağa qoyması və ya hakim onu namaza dəvət etdiyi halda öldürülməyi namazdan üstün tutması kimi əqidəsinin fəsadına dəlalət edən bir əməli ilə birləşərsə o, kimsənin küfrü etiqadi küfrə dönə bilər. Bu qaydanı unutma! Çünki mühümdür». İbn Qeyyim – *rahmətullahi aleyhi* – sözünə davam edərək deyir: «Allah və Rəsulu, ona küfr sifətini verdikdən sonra onu namaz qılandan nəfy[59] etmək mümkün deyildir. Lakin bu küfr, əməli küfrdür, etiqadi küfr deyildir. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in zina edən, oğurluq edən, içki içən, qonşusunun şərrindən əmin olmayan və s kimsələrdən imanı nəfy etmişdir. İman ismi şamil edilməyən kimsələr, əməl tərəfdən küfrdədilər. Lakin bu etqadi küfr deyildir. Belələrindən inkar və etiqadi küfr meydana gəlməmişdir».

Mən də deyirəm ki: «Bu kimi əməlləri edənlərə küfr sözü mütləq şəkildə istifadə olunaraq: «Zina edən kafirdir» sözü bir tərəfə, «Zina edən küfrə girdi» demək belə caiz deyildir. Nasların hər biri ilə hərəkət edərək həddi aşmamaq lazımdır. Bəbut-təğliz[60] adlanan hədislərdə zikr edilən, bu və buna bənzəri onun həqiqi mənası dərk olunmadan hər əməli tərk edən üçün: «Kafir və qanı mübahdır» kimi kəlimələri işlətmək doğru deyildir. İbn Qeyyim – *rahmətullahi aleyhi* – Peyğəmbər - *sallallahu aleyhi və səlləm* –in: «Müsəlmanı söymək fasiqlikdir, onu öldürmək (onunla vuruşmaq-**(K.H)**) isə küfrdür»[61]. Səhih hədisini zikr etdikdən sonra belə deyir: «Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in bu hədisində əməli küfrü qəsd edib; kişini İslam dairəsindən çıxardan etiqadi küfrü qəsd etmədiyi məlumdur. İman ismi, zina və ya oğurluq edən kimsədən qaldırılsada o, kimsə İslam ümmətindən çıxmaz. Bu müfəssl qayda, ümmətin Allahın Kitabını, İslami küfrü və onu vacib edən şeyləri ən yaxşı bilən sahabənin sözləridir. (İbn Qeyyim davam edərək) İbn Abbas – *radıyallahu anhu* –nun: **«Kim Allahın nazil etdiyi** (Kitab və Şəriət) **ilə hökm etməyənlər, əlbəttə kafirdilər!»** (əl-Maidə 44) ayəsi haqqında: «O, insanların zənn etdikləri küfr deyildir» sözünü zikr etməkdədir.

Mən də deyirəm ki, Həkim «Mustədrək» 2/313-də İbn Abbas – *radıyallahu anhu* – nun sözlərini bu şəkildə ətraflı rəvayət etmişdir: «O, küfr sahibini İslam müllətindən çıxaran küfr deyildir. Ondan daha alt səviyyədə olan bir küfrdür». Həkim və İmam Zəhəbi bu xəbəri səhihləmişlər. İbn Abbas – *radıyallahu anhu* –

---

[59] Nəfy – inkar etmək - **(K.H).**
[60] Bu məsələ ilə bağlı şiddətli hədislrin qeyd olunduğu babın adıdır - **(K.H).**
[61] əl-Albani «Ğayətil Məram» 442, «Təhricu Tahavi» 369.

nun bu təfsiri, təkfir firqəsinin və (bu məsələdə) həddi aşan sapıqların bel sümüyünü qıran bir dəlildir.

İbn Qeyyim – *rahmətullahi aleyhi* – sözünə davam edərək deyir: «Namazı tərk edən kimsədən imanı nəfy etmək, böyük günahları edən kimsədən imanı nəfy etməkdən daha münasibdir. Namazı tərk edən kimsədən İslamı nəfy etmək, müsəlmanların dilindən və əlindən salamat olmayan kimsədən İslamı nəfy etməkdən daha münasibdir. Namazı tərk edən kimsədə hər nə qədər İman və İslam şübhələri olursa olsun o, kimsə mömin və ya müsəlman deyə adlandırılmaz».

Mən də deyirəm ki, İbn Qeyyim – *rahmətullahi aleyhi* – nin namazı tərk edən kimsədən zikr olunan isimləri nəfy etməsi münaqişəyə aparır və doğru deyildir. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – dən zikr olunan hədisdə: «…Onu öldürmək (onunla vuruşmaq-**(K.H)**) isə küfrdür»[62] deyə buyurarkən, bununla bərabər Allah Qurani Kərimdə: **«Əgər möminlərdən iki dəstə vuruşarlarsa onların arasını düzəldin…»** (əl-Hucurat 9) buyurmuş və təcavüzkar dəstəni mömin deyə adlandırmışır. Beləliklə belə bir müsəlmanı küfrlə vəsf etmək və müsəlman sifətini ondan nəfy etmək bir tərəfə, onu mömin sifəti ilə vəsf etmək lazımdır. Namazı tərk edənin vəziyyəti də eyni ilə belədir. İbn Qeyyim – *rahmətullahi aleyhi* – namazı tərk edəndən o, sifətləri nəfy edərkən: «Namazı qılmayan kamil bir müsəlman deyil» deyirsə bu müstəsnadır. Lakin bu da yenə çox uzaq bir ehtimaldır.

## İBN QEYYİM-*RAHMƏTULLAHİ ALEYHİ*- nin QƏTİ İFADƏLƏRDƏN ÇƏKİNMƏSİ

İbn Qeyyim: «Bəli… namazı tərk edənə imanı fayda verir, onu Cəhənnəm atəşində əbədi qalmaqdan qurtarırmı? demək qaldı» demişdi. Sonra bu suala belə cavab verir: «Tərk olunan, qalan imanın səhihliyi və mötəbərliyində şərt deyilsə o, kimsəyə fayda verir. Tərk olunan, yerdə qalan imanın mötəbərliyinə şərt sayılırsa onda o, kimsəyə fayda verməz. Namaz imanın səhih olması üçün şərtdirmi? Bax, məsələnin sirri elə budur».

Mən də deyirəm ki, İbn Qeyyim – *rahmətullahi aleyhi* – yuxarıda qeyd olunan ifadələrdən sonra namazı tərk edəni təkfir edən birinci qrup üçün zikr etdiyi dəlillərə işarə edərək belə demişdir: «Bunlar, namaz əməli olmadan qulun əməllərindən heç bir şeyin qəbul olunmayacağına dəlalət edir».

Mən də deyirəm ki, İbn Qeyyim – *rahmətullahi aleyhi* – əməli küfrlə etiqadi küfrü bir-birindən ayırd edən və bir müsəlmanın əməli küfrlə İslam ümmətindən çıxmayacağını açıqlayan dəyərli araşdırmasında namazı tərk edəni təkfir edən qrupun bir çox dəlillərini zikr etdiyi halda, bu haqda qəti bir hökm verə bilməmişdir. Çünki bu dəlillərin hamısı əməli küfrə dəlalət etməməkdədir. Buna görə də sonda: «Namazı tərk edənin imanı ona fayda verirmi? İmanın səhihliyi üçün namaz şərtdirmi?» kimi suallara sığınmışdır.

İbn Qeyyim – *rahmətullahi aleyhi* – nin zikr olunan suallara verdiyi cavbları yaxşıca düşünən hər bir insaf sahibi, onun qəti cavab verməkdən çəkinib saleh

---

[62] Buxari 48, Müslim 64,116.

əməllər namazsız qəbul olunmaz dediyini görəcəkdir. Bəs imanın səhih olması üçün namazın şərt olmasına verdiyi cavabı haradadır? Burada imanın kamilliyi üçün namazın şərt olmasını nəzərdə tutmuram. Çünki Əhli Sünnətə görə imanın kamil olması üçün əməllərin hamısı şərtdir[63], sadəcə namaz deyildir. Bu görüşə Xaricilər və Mötəzilə əqidəsində olanlar müxalif olmuş və böyük günah edənlərin atəşdə əbədi qalacaqlarını söyləmişlər. Xaricilər isə böyük günah edənləri açıq-aydın təkfir etmişlər.

## TƏKFİR EDƏNLƏRİN BƏZİ GÖRÜŞLƏRDƏ XARİCİLƏRLƏ BİRLƏŞMƏSİ

Bir kimsə durub, namaz imanın səhihliyi üçün şərtdir, onu tərk edən isə atəşdə əbədi qalacaqdır desə, o kimsə Xaricilərlə bəzi görüşlərində birləşmiş olur. Daha qorxulu orasıdır ki, zikr etdiyimiz şəfaət hədisinə müxalif olmuş olur.

## NAMAZ QILMAYAN HANSI HALDA TƏKFİR EDİLİR?

İbn Qeyyim – *rahmətullahi aleyhi* – zikr olunan cavabdan çəkinərək, bir tərəfdən namazın İslamdakı yerini göstərmək, digər tərəfdən isə imanın səhihliyi üçün namazın şərt olduğuna dair heç bir dəlilin olmadığını hiss etdirmək istəmişdir. Beləliklə namazı tənbəllik ilə tərk edən kimsə İbn Qeyyim – *rahmətullahi aleyhi* –yə görə küfrə girməz. Lakin o, kimsədə namazı tənbəllik ilə tərk etməklə bərabər etiqadi küfr də olarsa o, zaman küfrə girər və İslam ümmətindən çıxar. Mən buna işarə etmişdim. Bu məsələ ilə bağlı araşdırmanın sonunda İbn Qeyyim – *rahmətullahi aleyhi* – nin bu sözləri də bunu göstrməkdədir: «Namazı tərk edən bir kimsə insanların hüzurunda, başının üzərində qılıncın parladığını görüb öldürülmək üçün əlləri və gözləri bağlanaraq namaz qılmağa dəvət edilir – ya namaz qılacaqsan, ya da öldürüləcəksən – deyildikdə: «Öldürün! Əsla namaz qılmayacağam» deyər və qılmamaqda israr edərsə belə bir kimsənin küfründə şübhə edən kimsələrə heyrət edilir».

Mən də deyirəm ki, o halda namazı tərk edəni təkfir edən qrupun bütün dəlillərini hakimin ölümlə qorxutmasına baxmayraq namazı qılmamaqda israr edib ondan imtina edən kimsələr üzərinə şamil etmək lazımdır. Belə olduğu zaman namazı tərk edəni təkfir edənlərə, etməyənlərin dəlilləri cəm edilmiş və eyni kəlimədə birləşmiş olur.

İbn Qeyyim – *rahmətullahi aleyhi* – nin ifadə etdiyi kimi sırf tənbəllik səbəbi ilə namazı tərk edən kimsə, təkfir edilməz. Çünki o, əməli küfrdür, etiqadi küfr deyildir.

## MƏSƏLƏ İLƏ BAĞLI İBN TEYMİYYƏ– *RAHMƏTULLAHİ ALEYHİ* – nin GÖRÜŞLƏRİ

Şeyxulislam İbn Teyniyyə – *rahmətullahi aleyhi* – də belə etmiş, zikr olunan dəlilləri bizim şamil etdiyimiz mənalara şamil etmişdir. Şeyxulislam «Məcmuul Fətava» 22/48-də üzürsüz olaraq namazı tərk edən müsəlmandırmı? deyə ondan

[63] Fəthul Bəri 1/46.

soruşulduqda elmi, üzun bir izahatla cavab vermişdir. Mən o, cavabdan mövzumuzla bağlı bir qismini buraya daxil edirəm: «Malik, Şafii, Əhməd kimi alimlərin yanında namazı tərk edən kimsənin öldürüləcəyini bəyan etdikdən sonra belə demişdir: «Namazı tərk edən öldürülüncəyə qədər qılmamaqda israr edərsə o, kafir mürtəd olaraqmı öldürülür, yoxsa ki, müsəlmanların fasiqləri kimi bir fasiq olaraqmı öldürülür?» sualına iki görüşlə cavb vermişdir. O, görüşlərin ikisidə İmam Əhməd– *rahmətullahi aleyhi* –dən rəvayət edilməkdədir. Bir kimsə namazın fərziyyətinə etiqad edib, batində (daxilində-**(K.H)**) onun qılınmasını iqrar edirsə öldürülüncəyə qədər namazı qılmamaqda israr etməsi qeyri mümkündür. İnsanların belə bir halı bilinməməkdədir. Buna görə də İslamda belə bir əməl meydana gəlməmişdir. Namazın fərziyyətinə etiqad edib onu qılmayan bir kimsəyə - namaz qılmasan biz səni öldürəcəyik – deyildiyi halda namazı tərk etməkdə israr edən bir kimsə bilinməməkdəir. Buna bənzər bir şey İslamda heç olmamışdır. Bir kimsə öldürülüncəyə qədər namaz qılmaqdan imtina etsə, o kimsə namazın fərziyyətini batində (daxilində-**(K.H)**) iqrar etməməklə və onu yerinə yetirməməklə müsəlmanların yekdilliklə qəbul etdiklərinə görə küfrə girmişdir. Bu kimi kimsələrin küfr etməsi ilə bağlı səhabələrin sözləri olduqca qabarıq şəkildədir. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in: «Qul ilə iman arasında bağ namazı tərk etməkdir»[64] hədisində də olduğu kimi səhih naslar da eyni şeyə dəlalət etməkdədir.

Kim ölənə qədər namazı qılmamaqda israr edər və Allaha tək bir səcdə də belə etməzsə, belə birisi namazın fərziyyətini iqrar etməməkdədir. Çünki namazın fərziyyətinə və onu tərk edənin öldürüləcəyinə etiqad, (bir kimsəni-**(K.H)**) namazı qılmağa dəvət edər. Bu çağırışçı qüdrətlə bərabər gücü çatdığını etməsi lazımdır. Gücü çatdığı halda heç etməmişsə o, kimsə haqqında dəvətçi olmadığı başa düşülür. Bir kimsənin namazı tərk edənin cəzaya məruz qalacağına dair tam bir etiqadı, onu namazı qılmağa sövq edər. Lakin bəzən buna müxalif xüsuslar olub namazın təhirə salınması, onun bəzi fərzlərinin tərk edilməsi və ya bəzən də namazın fovti (ötməsi, keçməsi-**K.H**) kimi halları da ola bilər. Bu hallar müstəsnalıq təşkil edir. Lakin namazı qılmamaqda israr edib, heç namazı qılmayan və onu tərk etməkdə israr edərək ölən kimsələrə gəldikdə isə, beləlləri müsəlman olmaz.

## NAMAZI BƏZƏN QILIB, BƏZƏN DƏ QILMAYANLARIN VƏZİYYƏTİ

İnsanların əksəriyyəti bəzən namazı qılır, bəzən də onu tərk edirlər. Bu kimi kimsələr onun haqqını layiqincə ödəmirlər. Bunlar **VAİD** altındadırlar. Sünnən kitablarında Ubadə b. Samit – *radıyallahu anhu* – nun hədisində Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurmuşdu: «Allah – *subhənəhu və təalə* – qullarına beş vaxt namaz fərz qılmışdır. Kim bu namazları səhlənkarlıq etmədən və qəsdən heç bir vaxtı tərk etmədən haqqı ila yerinə yetirərsə, Allah onu Cənnətinə daxil edəcəyinə dair söz vermişdir. Kim də bu beş vaxt namazı

[64] 15-16-cı sətraltı qeydə bax.

qılmazsa Allahın ona heç bir sözü yoxdur. İstərsə onu Cənnətə daxil edər, istərsə də ona əzab verər»[65].

Namazlarını mühafizə edənlər, onlar Allahın əmr etdiyi kimi (namazlarını) vaxtında qılanlardır. Namazlarını bəzən təxirə salıb vaxtından sonraya keçirənlər və ya onun fərzlərini tərk edənlər Allahın diləməsi altındadırlar. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in: «Qiyamət günü qulun ilk olaraq hesaba çəkiləcəyi şey heç şübhəsiz ki, namazıdır. Qul onu (qılaraq) tamamlamışsa nə gözəl. Yox (əgər onları tamamlamamışsa), onun nafilə namazlarına baxın var mı? deyilər. Qulun nafilə namazı varsa onlarla fərz namazı tamamlanır. Sonra digər əməllərin də (hesabı) belə edilər»[66] hədisində olduğu kimi bu kimsələrin nöqsan buraxdıqları fərzlərini nafilə ibadətləri tamamlaya bilər.

Əhməd b. Hənbəl – *rahmətullahi aleyhi* – nin mutəaxxirin alimlərindən[67] bəzilərinin təfsilatsız olaraq yaydıqları – namazı tərk edəni təkfir ilə bağlı sözü, İbn Teymiyyə – *rahmətullahi aleyhi* – nin bu izahatıyla onun hansı mənaya gəldiyinə açıqca dəlalət etməkdədir.

## İMAM ƏHMƏD – *RAHMƏTULLAHİ ALEYHİ* – nin MƏSƏLƏ İLƏ BAĞLI MÖVQEYİ

Əhməd b. Hənbəl – *rahmətullahi aleyhi* – nin məsələ ilə bağlı sözü onların yaydıqlarının əksinə dəlalət etməkdədir. Çünki o, bu səhih hədisə müxaliflik etməz. Əhməd – *rahmətullahi aleyhi* – nin bu hədisə müxalifliyi necə mümkün ola bilər ki? Bu hədisi və bunun mənasına gələn Aişə – *radıyallahu anhə* – nin hədisini «Musnəd» əsərində rəvayət edən özüdür.

Oğlu Abdullah «Məsail» isimli kitabında 55-ci s. bunları zikr edir: «Atamdan qəsdən namazı tərk edənin hökmünü soruşdum». Mənə belə dedi: «Namazı qəsdən tərk edib qılmayan və onu vaxtından sonra qılan kimsəni üç gün bu əmələ dəvət edərəm. Namazı qılarsa nə gözəl, əksi təqdirdə boynunu vuraram. Namazı qılmamaqda israr edib boynunu vurduğum kimsə yanımda mürtəd hökmündədir».

Mən də deyirəm ki, İmam Əhməd – *rahmətullahi aleyhi* – nin bu ifadəsi namazı mücərrəd[68] tərk etmək səbəbi ilə bir kimsənin küfrə girməyəcəyini; lakin namazı qılmadıqda öldürüləcəyini yaxşı bildiyi halda onu qılmaqdan imtina etdiyində küfrə girdiyini isbat edər. Bu kimsə əleyhinə belə bir hökmün verilməsinin səbəbi, öldürülməyi namaz qılmaqdan üstün tutmasıdır. Onun bu israrı küfrün etiqadi olduğuna, sahibinin də öldürülməyə haqlı olduğuna dəlalət edər. Bu ifadələrin bir bənzərini də İbn Teymiyyə – *rahmətullahi aleyhi* – nin babası – Məcdubni Teymiyyə Hənbəli fikhində yazılmış «Muhərrər» isimli kitabının 62-ci s: «Kim bir namazı inkar etmədən tənbəllik səbəbi ilə tərk edərsə, namaz qılmaqla əmr olunur. Vaxtı çıxana qədər qılmamaqda israr edərsə

---

[65] Əbu Davud 1420, Nəsəi 460, Məlik 1/123/14, əl-Albani «Səhihut Tərğib» 363, İbn Əbdul Bərr «Təmhid» 23/289-301 – **M.Y.**

[66] Əbu Davud 864, İbn Məcə 1425,1426, Əhməd 4/103, Təbərani «M. Kəbir» 10425 – **M.Y.**

[67] Son dövr alimlərindən - **(K.H).**

[68] Heç bir səbəb olmadan (fərziyyətini inkar etmədən və s. səbəblər olmadan) nmazı tərk etmək. - **(K.H).**

o, kimsənin öldürülməsi lazım olur» şəkilindəki ifadəsi yuxarıda izah edilən Əhməd b Hənbəlin sözünə bənzəməkdədir.

Mən də deyirəm ki, Şeyxulislamın babası sadəcə namazı təxirə saldığına görə sahibini təkfir etməmişdir».

Buna görə Əbu Cəfər ət-Tahavi «Müşkülü Asar» 4/228 isimli kitabında bu məsələ ilə bağlı açdığı babda iki qrupun dəlillərini nəql edib namazı tərk edənin küfrə girməyəcəyi görüşünü mənimsəmiş və demişdir: «Biz namazı tərk edənə namaz qılmasını əmr edərik, lakin biz kafirə əvvəl namazı qılmasını əmr etmərik. Namazı tərk edən bu əməli ilə kafir olsaydı biz ona əvvəl İslamı əmr edərdik. Namazı tərk edənə İslama girməsini əmr etməyib namazı qılmasını əmr etməmiz o, kimsənin **«əhli-namazdan»** olduğuna dəlalət edər. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in Ramazan ayında qəsdən orucunu pozan kimsəyə kəffarəni və orucu əmr etməsi də yenə eyni qəbildəndir. Oruc da müsəlmandan başqa qeyri müsəlman-dan qəbul edilməz. Necə ki, bir kimsə İslamın fərz qıldığı beş vaxt namazı, Ramazan orucu kimi ibadətlərdən bir ibadəti etmədən öncə Kəlmeyi Şəhadəti (İslamı) iqrar edərək müsəlman olursa, yenə də iqrar etdiyi Kəlmeyi Şəhadəti inkar edərək kafir olur. Əməllərdən birini inkarsız tərk etdiyinə görə isə kafir olmaz. Onun müsəlmanlığı İslamı iqrar etməsi ilə idi, beləliklə də mürtədliyi də ancaq İslamı inkar etməsi ilə olur».

Mən də deyirəm ki, bu gözəl bir fikir və sağlam bir sözdür. Onda rədd ediləcək bir şey də yoxdur.

İmam Təhavinin bu ifadələri, İmam Əhmədin zikri keçən sözləri ilə təmamən uyğunlaşmaqdadır. Əhmədin sözləri: «Namazı qılmayan mücərrəd onu tərk etdiyi üçün küfrə girməz, əksinə o, kimsə namaza dəvət edildikdən sonra onu qılmamaqdan imtina edərsə və qılmamaqda israr edərsə» mənasına dəlalət etməkdədir.

## HƏNBƏLİ ALİMLƏRİNİN MƏSƏLƏYƏ BAXIŞLARI

İmam Əhməd – *rahmətullahi aleyhi* – nin sözlərini şamil etdiyim bu mənanın doğruluğunu sübut edən dəlillərdən biri də Şeyx Aladdin əl-Mərdaviyyinin «Əhməd b. Hənbəlin məzhəbində: «İxtilafi məsələlərdə racih (üstün-**(K.H)**) olanı tanımaqdakı insaf ölçüsü» isimli kitabında 1/402-ci səhifədə Əhmədin: «Namazı tərk edəni üç dəfə tövbəyə dəvət edərəm…» sözünü şərh edərkən belə demişdir: «Namazı tərk edəni tövbəyə dəvət edən ya əmir ya da onun vəkili olur. O, kimsə bir çox namazı tərk etmiş olsa da əmirin onu tövbəyə dəvət etməsindən əvvəl öldürülməsi düzgün olmaz. Əhməd b. Hənbəlin məzhəbinin səhih görüşünə görə o, kimsə təkfir də edilməz. Səhabələrimizin çoxunun üzərində ittifaq etdikləri doğru görüş də elə bu görüşdür.

Əbu Abdullah b. Batta – *rahmətullahi aleyhi* – də eyni görüşü seçdiyini əş-Şeyx Əbul Fərəc Abdurrahman b. Qudamə əl-Məqdisi, İmam Muvəffəkuddinin «əl-Muğni» isimli kitabına yazdığı şərhində (yəni) «Şərhi Kəbir» 1/385-də iddia etmişdir. Sonra da bu cümlələri zikr etmişdir: «Abdullah b. Batta namazı qılmayan kimsənin küfrünü söyləyən kimsələri rədd etmişdir». Əbul Fərəc Abdullah b. Batta – *rahmətullahi aleyhi* – nin sözləri üçün: «O, söz eyni zamanda

fəqihlərin sözüdür. Əbu Hənifə, Məlik, Şafii və s. imamlar bunlardandır» demişdir. Daha sonra bu fəqihlərin görüşlərinin doğruluğunu sübut edən hədislərlə məsələni dəlillərlə sübuta yetirmişdir. Bu, hədislərin çoxunu İbn Qeyyim – *rahmətullahi aleyhi* – kitabında zikr etmişdir. Onlardan biri də İbn Teymiyyə – *rahmətullahi aleyhi* – nin sözləri zikr edilərkən rəvayət edilən Ubadə b. Samit hədisidir. Əbul Fərəc zikr olunan ifadələrini belə bildirməkdədir: «Namazı tərk edən mütləq olaraq kafir olsaydı İbn Teymiyyə – *rahmətullahi aleyhi* – onu Allahın diləməsinə buraxmazdı».

Mən də deyirəm ki, bu görüşü kitabımızın əsası etdiyimiz Əbu Səid hədisi və Aişə – *radıyallahu anhum* – un hədisi şübhəyə yer buraxmayacaq şəkildə təkid etməkdədir. Bunu yaddan çıxarmamalısan.

Sonra Əbul Fərəc sözünə belə davam edir: «Namazı tərk edənin mütləq olaraq təkfir edilməməsində müsəlmanların icması vardır. Çünki biz heç bir zaman namazı tərk edənin ölüsünün yuyulmadığını, namazının qılınmadığını və mirasının mirasçılara verilmədiyini bilmirik. Namazı tərk edən küfrə girmiş olsaydı bu hökümlər əlbətdə yerinə yetrilərdi. Namazı tərk edənin tərk etdiyi namazıları qəza etməsinin vacibliyi xüsusunda müsəlmanlar arasında ixtilaf olduğunu bilirik. Bununla bərabər onlar mürtədin namazı qəza etməsi haqqında ixtilaf etməmişlər. Lakin mütəqəddim (keçən-**K.H**) hədislərə gəlincə[69] onlar təqliz babı[70] və kafirlərə bənzətmə yönündə olub həqiqi mənası üzrə deyildir. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in: «Müsəlmanı söymək fasiqlikdir, onunla vuruşmaq isə küfrdür»[71] hədisi və s. bənzəri hədislər də bu babdandır. Bunlar təhdid edilməkdə şiddət bildirən hədislərdir». Bu görüş üçün şeyximiz Muvəffəkuddin əl-Məqdisi: «Allah ən doğrusunu bilir, sözləri doğrusu da elə budur» demişdir.

Mən də deyirəm ki, Məhəmməd b. AbdulVahhab – *rahmətullahi aleyhi* – İbn Qudamənin «əl-Muğni» 1/95-96 isimli kitabına yazdığı haşiyədə bu görüşü zikr edir və özü də eyni görüşdə olduğunu iqrar edir. İmam Şəukani «əs-Seylul Cərrad» 1/292-də namazı qədsən tərk edənin küfrə girdiyi, öldürülməsi vacib olduğunu, müsəlmanların əmirinin onu öldürməli olduğunu ifadə edərkən; «Neylul Əvtar» 1/294-295 isimli kitabında namazı qılmayanın küfründən bağışlanmayan küfrü qəsd etmədiyini açıqlamışdır.

Alimlərin bu xüsudakı ixtilaflı görüşlərini və dəlillərini zikr etdikdən sonra belə demişdir: «Doğrusu namazı tərk edən kafirdir və öldürülür. Küfrünə gəlincə, namazı tərk edəni **ŞARİ** – (Allah və Rəsulu-**(K.H)**) bu isimlə adlandırdığı hədislər səhih olaraq rəvayət edilmişdir. **ŞARİ** - bir kimsə ilə ona bu adı vermək arasına namaı qoymuşdur. Bir kimsənin namazı tərk etməsi bu adı ona verməyi caiz edir.

---

[69] «Kişi ilə küfr arasında namazın tərki vardır» hədisi kimi tərk edəni küfrə nisbət edən təkfirçilərin dəlil gətirdikləri hədisləri qəsd edir – **(M.Y).**

[70] Bu məsələ ilə bağlı şiddətli hədislrin qeyd olunduğu babın adıdır - **(K.H).**

[71] 57-58-ci sətraltı qeyiddə hədisdə gələn «vuruşmaq» kəliməsi əvəzinə «öldürmək» kəliməsi işlədilmişdir. Buxari 48, Müslim 64,116, əl-Albani «Ğayətil Məram» 442, «Təhricu Tahavi» 369 - **(K.H).**

Birinci qrupun ortaya qoyduğu etirazlar bizə lazım deyildir. Çünki biz küfrün bəzi növlərinin məğfirət və şəfaətlə bağışlana biləcəyini söyləyirik. Qiblə əhlinin bəzi günahları etməsini **ŞARİ** - küfr deyə adlandırmışdır. Burada insanların ilişib qaldıqları yorumlara girməyə ehtiyac yoxdur. İmam Şəukani – *rahmətullahi aleyhi* – nin bu ifadəsi doğrudur. Lakin Şəukaninin namazı tərk edənə «kafir» adı verməsinin caiz olduğu görüşünə getməsi, məsələni genişlədib həddini aşmaqdır ki, bu heç də təriflənəsi bir şey deyildir. Çünki namazın tərk edilməsi ilə bağlı işarə etdiyi hədislərdə (onun) iddia etdiyi kimi kafir sözü mütləq olaraq gəlməmişdir (deyilməmişdir-**(K.H)**). Hədislərdə ifadə «küfrə girər» şəkilindədir.

Şəukani – *rahmətullahi aleyhi* : «**KƏFƏRA**» felindən ismi fail olan «**KAFİR**» sözünün mənasını almasına razılıq verəcək bir kimsənin olacağını zənn etmirəm. Əgər belə bir kimsə varsa onun: «Allahdan başqasına and içən, müsəlmanı öldürən, nəsəbindən uzaq olan və s. bunlara bənzər günahları edən hər kəsə «**KAFİR**» sifətini mütləq olaraq istifadə etməsi lazımdır».

Əbu Yala və digər hədisçilərin İbn Abbas – *radıyallahu anhu* – dan mərfu olaraq rəvayət etdikləri: «İslamın əsaslandığı təməllər və dinin qaydaları üç dənədir. Kim onlardan birini tərk edərsə bu səbəblə kafir olur, qanı da mübahdır. Onlar – Allahdan başqa ilah olmadığına şəhadət, fərz namazlar və ramazan orucudur»[72] hədisi əgər səhih olsaydı namazı tərk edən kimsəyə kafir sifətini mütləq olaraq söyləməyin caizliyinə dair açıq-aydın bir dəlil olardı. Lakin hədis səhih deyildir. «Zəif Hədislər Silsiləsi» 94-də bu xüsusu açıqladım.

Xülasə: Mücərrəd namazı tərk etmək bir müsəlmanı təkfir etmək üçün hüccət olmaz. Namazı tərk edən fasiqdir. İşi də Allaha qalmışdır. Allah diləyərsə ona əzab verər, diləyərsə onu bağışlayar. Bu kitabın əsasını təşkil edən hədis, bu məsələdə heç bir müsəlmanın şübhə etməyəcəyi açıq-aydın bir nasıdr, onu tərk edə bilməz.

Namazı qılmayan bir kimsə onu qılmağa dəvət olunur, əgər qılmazsa ölümlə təhdid edilir. Buna baxmayaraq namazı qılmamağa davam edərsə bu kimsə kafir olaraq öldürülür. Onun qanı da mübahdır. Onun cənazə namazı qılınmaz və müsəlmanların qəbristanlığında da dəfn edilməz.

Namazı tərk edəni mütləq olaraq təkfir edən xəta edir. Küfrün heç bir növünə nisbət etməyən, namazı qılmayan tam mömindir deyən kimsə də xəta etmişdir. Doğrusu bu məsələ müfəssəl şəkildə izaha ehtiyacı olan bir məsələdir.

## TƏƏSSÜBKEŞ CAHİLLƏRƏ XƏBƏRDARLIQ VƏ HUZEYFƏ HƏDİSİNİN SƏHİHLİYİ

Bu haqdır bunda heç bir gizli şey yoxdur. Cahillərdən əl çək! Ən çox qorxduğum bəzi təəssübkeş cahillərin vacibiyyətinə iman etməklə bərabər tənbəllik səbəbi ilə namazı tərk edən kimsənin: «…Şirkdən başqa hər şeyi istədiyinə bağışlayar…» ayəsinin ümumi mənasına daxil olduğuna zikr olunan hədis dəlil olduğu halda onu rədd etməyə çalışırlar. Onlardan bəzisi son olaraq 1987-ci ildə belə etmişlər. Tələbələrdən iki nəfər, biri Səudiyyəli, digəri isə

---

[72] Əbu Yəla «Musnəd» 2349.

Misirli bir-biriyləköməkləşərək «Səhih Hədislər Silsiləsi»-nin ilk yüz hədisinin bəzilərində məni tənqid etmişdirlər. Onların məni tənqid etdikləri hədislərdən biri də 87-ci nömrə ilə rəvayət etdiyim Huzeyfə b. Yəmən – *radıyallahu anhu* – nun hədisidir. Hədisin mətni belədir: Peyğəmbər– *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günü İslam paltarın naxışları köhnələrək silinib yox olduğu kimi silinib yox olacaqdır. Belə ki, (yer üzündə) nə orucun, nə namazın, nə həccin, nə də zəkatın nə olduğu bilinməyəcəkdir. Allah bir gecədə Quranı qaldıracaq və yer üzündə ondan bir ayə belə qalmayacaqdır. O, zaman insanlardan yaşlılar və böyüklər qalacaqlar və deyəcəklər: «Biz babalarımızın bu kəlməni: «Lə iləhə illəllah» - söylədiklərini eşitdik. Buna görə də biz də onu söyləyirik»[73]. Sıla b. Zufər, Huzeyfəyə: «Onlar orucun, namazın, həccin, sədəqənin (zəkatın) nə olduğunu bilmədikləri halda «Lə İləhə İlləllah» demələri onlara nə qazandırır» demiş və bunu bir neçə dəfə təkrar etmişdir. Hər dəfə də Huzeyfə b. Yəmən - *radıyallahu anhu* – Sılaya cavab vermək istəməmişsə də sonda: «Ey Sıla bu sözlər onları Cəhənnəmdən qurtaracaqdır» demiş və sözlərini üç dəfə təkrar etmişdir.

Adları çəkilən tələbələr bu hədisi səhihlədiyim üçün mənə rəddiyə yazaraq bu hədisi zəiflətmək üçün üç böyük kağız qaralamışlar. Onlar bu hədisi zəif edərkən hədisin sənədində Əbu Muaviyyə Məhəmməd b. Həzm əd-Darirdən başqa əllərinə keçəcək bir şey tapmamışlar. Onların iddialarına görə Əbu Muavuyyə murciyə görüşündədir və bu hədis də o, görüşü dəstəkləməkdədir. Bu elimsizliyin çata biləcəyi ən son həddidir. Onun ölçülərini açıqlamağa indi imkan yoxdur. Lakin bir-iki kəlimə söyləməyim lazımdır. Əbu Muaviyə Buxari və Müslimin hüccət qəbul etdikləri siqa (etibrlı) bir kimsədir. Bununla bərabər ona, onun kimi siqa olan başqa bir ravi də ondan rəvayət etmişdir. Hədisin murciyə görüşü ilə heç bir əlaqəsi yoxdur. Onlar bu xətaya hədis elmini bilmədiklərinə görə düşmüşlər. Yoxsa başqa cür mümkün deyildir? Bu hədisi Həkim, Zəhəbi, İbn Teymiyyə, İbn Həcər və əl-Busiri (kimi alimlər-**K.H**) səhih demişlər. Onlara görə zikr olunan hədisə səhih deyərkən bu alimlərdən hər biri də xəta etmiş və bu gənclər adları çəkilən alimlərin murciyə görüşünü təsdiq edən hədislərə səhih dediklərinə inandıqları üçün iki böyük xətaya yol vermişlər. Bu xətalar isə: «Bu hədis elminə, ondan başı çıxmyan cahillərin baş qoşması və elm əhlinin səhih dediyi hədisləri bu kimi uşaqların zəif deməleridir».

## HUZEYFƏ HƏDİSİNİN İZAHI

Bu səhih hədislə qəsd edilən məna: «Bəzi kimsələrin cəhaləti onları elə bir həddə çatdırmışdır ki, İslamdan, şəhadətdən başqa bir şey bilməzlər deməkdir. Onlar namazın vacibiyytini və digər İslamın rükunlarını bilir və bununla bərabər onları yerinə yetirmirlər demək deyildir. Əksinə hədisdə belə bir məna yoxdur. Əksinə onlar çöldə yaşayan və ya küfr ölkələrində yeni müsəlman olmuş İslamdan, şəhadət kəliməsindən başqa bir şey bilməyən kimsələr kimidir. Bəzi böyük şəhərlərdə də belə bir şeylər meydana gələ bilər. Məsələn: «Böyük şəhərlərdən birində yaşayan bir kimsə telefonla mənə zəng edərək: «Təzə evləndiyi zövcəsinin cinsi əlaqədən sonra qüsl almadan namaz qıldığını və onun səhih olub olma-

---

[73] İbn Məcə 4049, Həkim 4/473.

dığını soruşdu». Bu yaxınlarda yenə də belə bir hadisə baş vermişdir. Özünün elm sahibi olduğun zənn edən və alimlərə müxalif olmağı özünə adət edən məscid imamı yetkinlik yaşına çatmış oğlunun ihtilam (pollyusiya-**(K.H)**) olduqdan sonra cünub olaraq namaz qıldığını və cünub olduqda qüsl etməyin fərz olduğunu bilmədiyini söyləmişdir.

## MÜSƏLMANI TƏKFİR ETMƏYƏ MANE OLAN HALLAR

İbn Teymiyyə – *rahmətullahi aleyhi* – «Məcmuu Fətava» 22/41-də belə demişdir: «Bir kimsə Peyğəmbər– *sallallahu aleyhi və səlləm* – in Allahın Rəsulu olduğunu bilsə və buna iman etsə, bu kimsəyə bilmədiyi məsələlər çatana qədər Allah ona əzab verməz. Allah bir kimsəyə təbliğ (dəvət) çatmadan imanı tərk etdiyi üçün əgər əzab verməzsə, imanın bəzi şərtlərini tərk edən kimsəyə əzab verməməsi daha münasib və daha məntiqlidir. Lakin təbliğ olunduqdan sonra iman etməz və ya imanın bəzi şərtlərini tərk edərsə bu müstəsnalıq təşkil edir. Bu kimi hallarda Peyğəmbər– *sallallahu aleyhi və səlləm* – in yayılmış və məşhur olan sünnəti də elə belədir».

Sonra İbn Teymiyyə – *rahmətullahi aleyhi* – bu ifadələrinə gözəl misallar zikr etməkdədir. Mustəhazə[74] halında olan qadının vəziyyəti də onlardan biridir: «Qadın mən çox şiddətli heyz oluram və bu hal məni namazdan, orucdan çəkindirir» dedikdə Peyğəmbər– *sallallahu aleyhi və səlləm* – ona: «İstihazə halında namaz qılmasını əmr etdi. Lakin (buna qədər) qılmadıqlarının qəza etməsini əmr etmədi»[75].

Mən də deyirəm ki, bu hədisdə zikr edilən qadın Fatimə b. Əbu Hubeyşə – *radıyallahu anhə* –dir. Hədis isə Buxari, Müslim və kitabım «Səhih Əbu Davud» 281-də və s. kitablarda rəvayət edilmişdir. Bu hədisin bir bənzəri də Abdurrahman b. Auf və zövcəsi Ummu Həbibə b. Cəhşin hədisidir. Mustəhazə halı yeddi il çəkmişdir. Hədis Buxari, Müslim və Səhih Əbu Davud 283-də rəvayət edilmişdir[76].

Bu məsələ ilə bağlı üçüncü misal da, Həmənə b. Cəhşin hədisir. Şexulislam İbn Teymiyyə – *rahmətullahi aleyhi* – nin işarə etdiyi bu səhabə xanımdır. Hədisdəki ifadəsi belədir: «…Mən çox şiddətli heyz oluram. Bu haqda fikrin nədir? Məni namazdan, orucdan və s. şeylərdən çəkindirdi…».

## İKİ AY NAMAZI TƏRK EDƏN HAQQINDA İMAM ƏHMƏD– *RAHMƏTULLAHİ ALEYHİ* – nin GÖRÜŞÜ

Yeri gəlmişkən İmam Əhməd – *rahmətullahi aleyhi* – nin namazı tərk edənlə bağlı başqa bir sözü də vardır. Əhməd – *rahmətullahi aleyhi* – nin əvvəl zikr etdiyi sözü ilə bu sözlərini bir-birinə cəm etmək lazımdır. Eyni zamanda Əhməd – *rahmətullahi aleyhi* – nin bu sözü də namazı tərk edənin mücərrəd onu

---

[74] Mustəhazə – adət halından daha çox qanı gələn xəstə qadın.
[75] Buxari 228, Müslim 333,62, Əbu Davud 296.
[76] Buxari 327, Müslim 334,64, Əbu Davud 287.

tərk etməsi ilə küfrə düşməyəcəyinə dəlalət edər. Lakin onun sözü səhf dəyərləndirilərək belə başa salınır.

Əhməd b. Hənbəl – *rahmətullahi aleyhi* – nin oğlu Abdulla «əl-Məsail» isimli kitabının 56-cı s belə deyir: «İki ay namaz qılmayan kimsənin vəziyyəti haqında atamdan soruşdum». Belə cavab verdi: «O, kimsə qılmadığı namzlardan xatırladığını hansı namazın vaxtında xatırlayıbsa o, vaxtı da qılmalıdır. O, namazlarını (namazın) ən son vaxtı çıxana qədər namazlarını qılmağa davam edər. O, vaxtın namazının fovt (ötməsindən, keçməsindən-**K.H**) qorxarsa həmin vaxtın namazını qılmalıdır. Onu da tərk edərək ikinci dəfə namazını buraxmaz. Sonra qayıdaraq irəlidəki namazın vaxtının çıxmasından qorxana qədər yenə də namaz qılmağa davam edər. Əgət tərk edilən namaz çox olarsa və namazı tərk edən də (ailsinin) ruzisini təmin edən bir kimsədirsə (namaz borcu olan kimsə) onların hamısını birdən qılacaq gücünə malik deyilsə (ailəsini) təmin edən şeyləri əldə edənə qədər çalışar. Sonra da namazını təkrar qılmağa davam edər. O, kimsə bir fərz namazı qılarkən ondan əvvəl qılmamış bir fərz namazını xatırlayarsa onu yerinə yetirər. Ona başqa bir namaz caiz deyildir.

Dəyərli oxuyucu! Əhməd – *rahmətullahi aleyhi* – nin bu sölərinə bir bax. Onun bu sözləri daha öncə zikr edilən: «Müsəlman, mücərəd namazı tərk etməklə İslamdan çıxmaz» həqiqətinə dəlalət etməkdədir. İki ay dalbadal namazı tərk etdiyi halda onu İslamdan çıxarmır. Hətta Əhməd – *rahmətullahi aleyhi* – ruzisini təmin etmək üçün onun bir qism namazıları təxirə salmasına da belə izn verir.

## İMAM ƏHMƏD NAMAZI TƏRK EDƏNİ MÜTLƏQ OLARAQ TƏKFİR ETMƏMİŞDİR

İmam Əhməd – *rahmətullahi aleyhi* – nin bu fətvası iki şeyə dəlalət etməkdədir.

**BİRİNCİSİ:** Bir az öncə zikr edildiyi kimi – qılınması lazım olan fovt (ötürdüyü, keçirdiyi-**K.H**) namazların hamısını qəza edərək, zimmətdən (boynundan düşməsə də) belə o, kimsə İslam üzərə qalmaqdadır.

**İKİNCİSİ:** Namazı qəza etmənin hökmü, (namazı vaxtında) yerinə yetirməyin hökmündən daha alt səviyyədədir. Çünki mən İmam Əhmədin – hətta elmdə ondan daha aşağı səviyyədə olan birisinin – yaşayışını təmin etmək üçün vaxtı çıxana qədər namazı tərk edməsinə izn verdiyinə inanmıram. Doğrusunu Allah bilir.

Müsəlman qardaşım! Bunu da bil ki, İmam Əhməd – *rahmətullahi aleyhi* – dən rəvayət edilən bu və bu mənada olan fətvası müsəlmanın özü və xüsusi ilə də İmam Əhməd – *rahmətullahi aleyhi* – üçün etimad göstərilməsi üçün vacib olan fətvasıdır. Çünki İmam Əhməd – *rahmətullahi aleyhi* –: «Hədis səhih olduğu vaxt o, mənim məzhəbimdir»[77] demişdir. İmam Əhməd – *rahmətullahi aleyhi* – nin bu fətvasına müxalif olaraq rəvayət edilən digər sözlər çox muttarib[78]

---

[77] Bu haqda geniş məlumat üçü Şeyx əl-Albani – *rahmətullahi aleyhi* – nin: «Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in namaz qılma şəkili» isimli kitabına baxa bilərsiniz.

[78] **MUTTARİB HƏDİS -** Bu o, hədisdir ki, bir və ya bir neçə ravilər tərəfindən müxtəlif formada rəvayət edilsin. Hansı ki, ravilər hədisin şərtlərinə görə qüvvədə də eynidilər. Bunların arasında

(qarışıq-**(K.H)**) və bir-birinə ziddir. Məsələn: «əl-İnsaf» 1/327-328-də və hənbəli məzhəbində etimad edilən digər kitablarda bu vəziyyəti görə bilərsən. O, sözlərin muttarib və bir-birinə zidd olmasına baxmayaraq namazı mücərrəd tərk etdiyi üçün müsəlmanın küfrə girəcəyi açıq-aydın ifadə edilmir.

Bu sözlərin vəziyyəti belə olduqda İmam Əhməddən mütləq mənalı ifadələri məhdudlaşdırıb və onun demək istədiyini açıqlayan ifadələrə aid edib onlarla izah edilməlidir. Onun namazı tərk edən haqqında həqiqəti demək istədiyi ifadələrini oğlu Abdullah vasitəsi ilə yuxarıda qeyd edilmişdir.

İmam Əhməd – *rahmətullahi aleyhi* – dən namazı mücərrəd tərk edənin küfrə girəcəyi haqında açıq-aydın bir fətva olduğunu fərz etsək belə o, fətvanı tərk edib, bu kitabın təməli olan – namazı tərk edənin zərrə qədər imanı olsa belə Cəhənnət atəşindən çıxacağını bildirən səhih hədisə uyğun fətvasını almağımız lazımdır.

Təhqiq əhli olan hənbəli aliməlrinin çoxu onun bu məsələ ilə bağlı görüşlərini belə açıqlamışdılar. Əbul Fərəcin ifadələrində zikr edilidiyi kimi İbn Qudamə əl-Məqdisi o, alimlərdən biridir. İbn Qudamənin bu məsələ ilə bağlı sözünün mətni belədir: «Beş ibadətdən birini tənbəllik səbəbi ilə bir kimsə tərk edərsə küfrə girməz». Bu ifadə «əl-Miğni» kitabındakı ifadəsidir. «əl-Muğni» 2/298-302-də geniş bir araşdırma və məsələdəki ixtilafa toxunaraq onların dəlillərini zikr etdikdən sonra «əl-Muğni» kitabından zikr etdiyim sözləri ilə məsələni bitirmişdir. İstəyən kimsə ora müraciət edə bilər.

İbn Qudamənin bu sözü, şübhə edilməyən doğru bir sözdür. Hənbəli alimlərindən «əş-Şərhul Kəbir» və «əl-İnsaf» isimli əhəmiyyətli qaynaqların müəllifləri də bu fikirdədilər.

İmam Əhməd – *rahmətullahi aleyhi* – nin fətvalarından onun bu məsələdəki səhih olan görüşlərini bildiyin zaman, İmam Şafii – *rahmətullahi aleyhi* – nin tərcümeyi halını yazarkən Subkinin, İmam Əhməd haqqındakı sözlərinin doğru olmadığını başa düşərsən.

# İMAM ŞAFİİ VƏ İMAM ƏHMƏD MÜBAHİSƏSİ

Subki «Tabaqatu Şafiyyətul Kubra» 1/220 isimli kitabında belə demişdir: «Hekayə (rəvayət) olunduğuna görə İmam Şafii ilə İmam Əhməd bir-birləri ilə namazı tərk edən haqqında mübahisə etdilər.

Şafii: Ya Əhməd! Namazı tərk edən kafir mi olur deyirsən?

Əhməd: Bəli, dedi.

Şafii: O, kimsə kafir olduğu vaxt nə ilə müsəlman olur?

Əhməd: Lə İləhə İlləllah Muhəmmədən Rəsulullah ilə.

Şafii: Axı, həmən şəxs bu sözü heç tərk etməmişdir.

Əhməd: Namaz qılaraq müsəlman olur.

Şafii: Kafirin namazı səhih olmadığına görə, namazla onun müsəlmanlığına hökm verilməz[79], deyincə İmam Əhməd susmuşdur.

---

düzgün olanı üzə çıxartmaq və cəm etmək də olmur. Bu ixtilaf yalnız ravinin və ravilərin yaddaşının zəifliyindən hiss edilir. Sənəddə və ya mətndə də ola bilər - **(K.H).**

[79] Çünki kafir nə qədər namaz qılsa da, oruc tutsa da, həcc etsə də onun bu ibadətləri səhih olmaz. Bu ibadətlərin səhih olması üçün ilk öncə Şəhadət Kəlməsi lazımdır - **(K.H).**

Mən də deyirəm ki, iki səbəbdən bu mübahisə İmam Əhməddən gəlməz.

**BİRİNCİSİ:** Bu mübahisə hekayəsi sabit deyildir. Buna görə də qissəni söyləyən Subki onu nəql edərkən sözünə: «Hekayə (rəvayət) olunduğuna görə» deyə başlamışdır. Bu hekayənin sənədi munqatidir[80] (yəni qopuqdur- **(K.H)**).

**İKİNCİSİ:** İmam Əhməd – *rahmətullahi aleyhi* – nin mücərrəd namazı tərk edən bir müsəlmanı təkfir edir sözünə əsasən söyləmişdir. Açıqlanması keçdiyi kimi İmam Əhməd – *rahmətullahi aleyhi* – nin mücərrəd namazı tərk edən bir müsəlmanı təkfir etməmişdir. Bu hekayəni söyləyən olsa-olsa zamanımızdakı mücərrəd namazı tərk edən müsəlmanları təkfir edən bəzi kimsələrdir. Mənim onlardan ümüdim – kitabı, üzərində bina etdiyimiz – bu səhih hədis ilə tanış olduqdan sonra bu hədisə uyğun Əhməd və digər hənbəli məzhəbinin böyük imamlarının sözlərinə qayıt-malarıdır.

# TÖVHİD ƏHLİ OLAN BİR KİMSƏNİ TƏKFİR ƏSLA CAİZ DEYİLDİR

Tövhid əhli olan bir müsəlmanı onun bir əməlinə görə təkfir etmək əsla caiz deyildir. Lakin namazı tərk edən Allahın şəriətini inkar etdiyi üçün və ya namaz qılmağa dəvət olunduğu halda qılmmaqda israr edərək öldürülürsə bu hal müstəsnadır.

Bu münasibətlə Hafiz İbn Həcər – *rahmətullahi aleyhi* – «Fəthul Bəri» 12/300 əsərində İmam Qazalidən nəql etdiyi sözləri zikr etmək istəyirəm. İbn Həcər belə demişdir: «İmakan olduqca namazı tərk edəni təkfir etməkdən çəkinməliyik. Tövhidi iqrar edən muvahhid müsəlmanın qanını axıtmağı mübah saymaq xətadır. Bir kafiri həyatda (sağ) buraxmaqdaki xəta bir müsəlmnın qanını tökməkdəki xətadan daha yüngüldür.

Vəziyyət belə olduğu halda bəzi kimsələr bu hədislə tanış olduqda, namazı tərk edən bir müsəlmanın kafirlərlə bərabər Cəhənnəmdə əbədi qalmayacağına dəlalət etdiyi halda insanları şübhəyə salmaları və atəşdən çıxardılanların cümləsində onun zikri keçmədiyini söyləmələri mənə çatmışdır. Bu əcaib bir təkəbbürlükdür. Belə bir mövqe mənə məzhəbi nəyin bahasına olursa-olsun saxlamaq məqsədi ilə səhih nasların dəlalət etdiyi şeyləri rədd edən bəzi təqlidçi təəssübkeş əhlini xatırladır. Şübhəsiz ki, bu hədis atəşdən ilk çıxanların üzlərinə atəş belə dəyməyən namazı qılanlardan olması, atəşdən ikinci və daha sonra çıxanların içərisində isə namaz qılmayanların belə olduğu açıq-aşkar və çox aydındır[81].

Buna baxmayaraq zikr olunan dəlillər bəzi təqlidin xəstə etdiyi muqallidlərə fayda verməzsə bizə düşən: **«Sələmun aleykum! Bizim cahillərlə işimiz yoxdur…»** (əl-Qəsəs 55) deməkdir.

# NƏTİCƏ

**XÜLASƏ:** Əbu Səid el-Xudri – *radıyallahu anhu* – nun rəvayət etdiyi bu «şəfaət hədisi» bir çox dəlaləti və mənaları etibarı ilə əzəmətli bir hədisdir. Zikr edildiyi kimi o, mənalardan biri də: «Fəriyyətinə imanla bərabər namazı tərk

---

[80] **MUNQATİ HƏDİS** – Bu o, hədisdir ki, ravinin düşməyi ilə sənəd Peyğəmbər – *sallallahu aleyhi vəs səlləm* – ə çatmır. Bu həmdə ardıcıl da olmur və sənədin bir neçə yerində olur - **(K.H).**

[81] 22-23-cü səhifədəki hədisi diqqətlə oxuduqda bu aydın olur – **(M.Y).**

edən kimsənin İslam millətindən çıxmayacağına. Kafir və müşriklərlə bərabər atəşdə əbədi qalmayacağına qəti bir dəlildir. Buna görə də zikr edilən hədisi və – eyni mənalı digər hədisləri – özündə birləşdirən bu risaləni oxuyan hər kəsdən fərziyyətinə iman etdikləri halda namzı tərk edən müsəlmanı, Allahı tövhid (bir edən müchidləri təkfir etməkdən çəkinmələrini səmimiyyətlə rica (xahiş-**(K.H)**) edirəm. Çünki bir müsəlmanı təkfir etmək – zikr edildiyi – kimi təhlükəli bir şeydir. Bu qardaşlarımıza namazın İslamdakı yerini və əzəmətini ayə ilə, səhih hədislə, sələfin yolu ilə ən gözəl üslubdan istifadə edərək nəsihət etməkdir.

Hökm təəssüf ki, alimlərin əlindən çıxdı. Buna görə də küfrü vacib edən hökmü yerinə yetirə bilmirlər. Müsəlmanların yaşadıqları bütün ölkələr bir tərəfə, öz ölkələrində[82] belə namazı tərk edənlərə, hətta namazı tərk edən bir nəfərə belə ölüm cəzasını tətbiq edə bilmirlər. Çünki tövbəyə dəvətindən sonra namazı tərk edəni öldürmək açıq-aydın bir hikmətə görədir. Bunun səbəbi namazın fərziyyətinə iman edərsə tövbə edər. Ölmü namaz qılmaqdan üstün tutub öldürülərsə bu əməl namazı tənbəllikdən tərk etmək olmadığına, əksinə namazı tərk etmək səbəbi inkara görə olduğuna dəlalət etməkdədir.

İbn Teymiyyə – *rahmətullahi aleyhi* – nin sözlərində də zikr olunduğu kimi bu halda bir kimsə kafirdir. Belə bir vəziyyətdə namazı qılmaqdan imtina etmək onu İslam ümmətindən çıxmasına dəlildir. Təssüf ki, bu gün bunun anlaşılmasına imkan yoxdur. O, halda alimlər fərziyyətinə imanla bərabər namazı tərk edənin təkfir edilməməsi ilə bağlı bütün imamların üzərində ittifaq etdikləri görüşləri ilə kifayətlənməlidirlər. Buna əsasən səhih sünnətdən qəti dəlil təqdim etdik. Bundan sonra heç kimsə üzürlü ola bilməz. **«Onun əmrinə qarşı çıxanları başlarına gələcək bir bəladan, yaxud da düçar olacaqları bir əzabdan qorxsunlar»** (ən-Nur 63)[83]. Sonda diqqətinizi iki məsələyə yönəltmək istəyirəm.

**BİRİNCİSİ:** Bu risalənin 28-ci səhifəsində İbn Qudamə – *rahmətullahi aleyhi* – dən bir neçə kəlimə nəql edildi. İbn Qudamə – *rahmətullahi aleyhi* – bu səhih hədislə tənbəllik səbəbi ilə namazı tərk edənin təkfir edilməyəcəyi haqqında olan doğru görüşünə dəlil gətirməyi (namazı-**K.H**) fovt (ötürənlərin, keçirənlərin-**K.H**) cümləsindəndir. Lakin qəribə burasıdır ki, o bir hədis zikr etməkdədir ki, əgər bu hədis səhih olsaydı ixtilafı kökündən kəsən dəlillərdən olardı. Çünki zikr olunan hədisdə: «Ənsarlardan birinin mövlası öldü. O, kimsə bəzən namaz qılır, bəzən də onu tərk edirdi. Peyğəmbər – *sallallahu aleyhi vəs səlləm* – onun yuyulmasını, cənazə namazının qılınmasını və dəfn edilməsini əmr etdi». İbn Qudamə hər nə qədər hədis haqqında bir şey deməsə də: Hallalın rəvayətində hədisin sənədini zikr edərək çox gözəl bir şey etmişdir. Çünki mənə hədisi araşdırma imkanı və ona zəif hökmünü verməyimi təmin etmişdir. Bu hədis zəif olduğu üçün: «Silsilətul Hədisi Daifə» 6036-da onu izah etmişəm.

**İKİNCİSİ:** Bu kitabın yazılışından bir neçə gün sonra bəzi qardaşlarım: «Fəthun Minəl Gağaffar bi İsbati Ənnə Tarikəs Salətu Leysə Minəl Kuffar» ismi ilə bir kitab göstərdilər. Müəllifin adı Ata b. Abdullatif Əhməddir. Kitabı

---

[82] Şeyx əl-Albani hər halda Səudiyyə və s. ölkələri qəsd edir – **(M.Y).**

[83] İmam Əhməd – *rahmətullahi aleyhi* – deyir ki: «Bu bəlanın nə olduğunu bilirsinizmi? Bəla şirkdir. Çünki bir kimsə Peyğəmbər – *sallallahu aleyhi vəs səlləm* – in sözlərindən bəzilərini rədd edəcək olursə qəlbinə bir miqdar azmaq düşər və sonda da məhv olub gedər» - **(K.H).**

gördükdə çox sevindim. Onun bəzi fəsillərini nəzərdən keçirdib oxuyunca sevincim daha da artdı. Müəllifin müxtəlif dəlilləri izah etməyə çalışdığını görüncə onun bu üslubunun elmi olduğunu mənə göstərdi. Müəllif hədisləri təxric edərək onların gəldiyi yolları və şahidlərini araşdırması, səhih və zəifi bir-birində ayırd etməsi mənim üçün kitabın ən önəmli tərəfidir. Çünki bu yolla zəifliyinə görə tərk olunmalı hədisləri tərk etmək, səhih olanları etimad, onlarla dəlil gətirmək və ya onlara cavab vermək asantlaşır.

Müəllif qardaşın – Allah ondan razı olsun – kitabında göstərdityi gözəl yol budur. Bəzi müəlliflər bu üsluba müxalif olaraq özlərinin doğru olduqlarını təsdiq edən hər şeyi toplayırlar. Onların sadəcə səhihini seçmirlər. Qadının üzü məsələsində mənə rəddiyə (cavab-**K.H**) yazan Misir və Səudiyyəli kimsələr belə etmişlər. Lakin Ata b. Abdullatif qardaş təkfir edənlərə rəddiyə yazarkən elmi bir yol seçmişdir. Onların dəllillərini araşdırmış, onların lehinə və əleyhinə olan hökmləri zikr etmişdir. Sonra bunlara müxalif olan dəlillərin arasını sağlam və qüvvətli bir üslubla cəm etmişdir. Bununla bərabər bəzən hədisləri səhihliyə uyğun hədislər etibarı ilə səhihləyərkən və onlarla namazı tərk edənin küfrə girəcəyinə dəlalət edən hədislərin arasını cəm edərkən ehtiyatlı davranmaqdan qurtulmamışlar. Məs: Namaz haqqında Əbu Dərda – *radıyallahu anhu* – nun rəvayət etdiyi: «Kim namazı tərk edərsə İslam ümmətindən çıxar…» mənasına gələn hədisdə belə etmişdir. Bu hədisin əleyhinə danışdıqdan və sənədinin zəif olduğunu bəyan etdikdən sonra, şahidlərlə onu gücləndirməyə çalışmışdır.

Bu şahid əslində qüsurlu şahiddir və zəif hədisi gücləndirməyə gücü çatmaz. Müəllifin bundan başqa da bir neçə zəif cəhətləri (xətaları-**K.H**) və təvili (yozmaları-**K.H**) vardır. «Zəif Hədislər Silsiləsi» 6037-nömrədə zikr etdiyim hədisdə də buna bənzər bir şey etmişdir. Lakin haqq olan odur ki, müəllifin kitabı özünə görə çox faydalı bir kitabdır. Müəllif həmən kitabda heç kəsin nə lehinə nə də əleyhinə təəssübkeşlik etmədən məsələ ilə bağlı müsbət və ya mənfi, qəbul və ya rəddi ifadə edən hər şeyi toplamışdır. Kitabın ən gözəl qismi ikinci babın birinci qismidir. Müəllif o, qismdə: «Namazı tərk edən kimsənin İslam millətindən çıxmayacağına hüccət olan xüsusi dəlillərdir» deyir və sonra orada on iki dənə dəlil zikr edir.

Bu başlığı kitabın müqəddiməsində oxuduqda, bu hədislərdən birinin bu kitabın əsasını təşkil edən şəfaət hədisinin olduğunu zənn etdim. Çünki bu hədis zikr edildiyi kimi hər insaf sahibinin yanında mübahisəyə son qoyan bir dəlildir. Lakin mütəaxxirin (son dövr alimləri-**K.H**) və mütəqəddim (köhnə dövr alimləri-**K.H**) alimlərinin bir çoxunun (bu hədisi-**K.H**) nəzərdən qaçırdıqları kimi, müəllif də nəzərdən qaçırmışdır. Lakin müəllifin dəlillərindən birinin əhəmiyyətli və təkfir edənlərin ondan qafil olduqlarına görə (bu hədisi-**K.H**) bəyan edib diqqətinizi ona cəlb etmək istəyirəm. O, dəlil də Peyğəmbər – *sallallahu aleyhi vəs səlləm* – in bu mübarək hədisidir: «Yolun işarə lövhələri olduğu kimi İslamın da işarə və əlamətləri vardır. Allaha iman edib, ona heç bir şeyi şərik qoşmamaq, namaz qılmaq, zəkat vermək, Ramazan ayında oruc tutmaq, Beytullahı (imkan olduqda-**K.H**) həcc etmək, əmr bil mərufvu (xeyirli işləri əmr etmək), nəhyi ənil munkəri (qadağan olunmuş şeylərdən çəkindirməyi) əmr etmək, ailənin yanına girdikdə onlara salam vermək, bir topluluğa yetişdikdə onlara salam vermək o,

əlamətlərdəndir. Onlardan bir şeyi tərk edən kimsə, İslamdan bir qismi tərk etmiş olar. Onların hamısını tərk edən kimsə isə arxasını İslama döndərmiş (İslamdan üz döndərmiş) olar». əl-Albani «Səhih Silsilələr» 333, Həkim 1/21, Əbu Nuaym «əl-Hiylə» 5/217-218.

Müəllif bu hədisin təxricini vermiş və onun gəlmə yollarını yaxşıca araşdırmışdır. Onlardan bəzisinin sənədinin səhih olduğunu açıqlamış, sonra hədisi namazı tərk edənin İslam millətindən çıxmayacağına açıq-aydın dəlalətini zikr etmişdir. Hədisi: «Səhih Hədislər Silsiləsi» 333-də otuz il bundan əvvəl təxricini etmişdim. Mütəaxxirin mütəqəddimdən istifadə etdiyi kimi, o da mənim təxricimdən istifadə etmiş, lakin ondan istifadə etdiyini bildirən kiçik bir işarə də belə göstərməmişdir. Belə etmiş olsaydı daha gözəl olardı və öz dəyərini bir daha artırmış olardı. Çünki müəllif bəzi hədislərin tənqidində xüsusi ilə mənim tənqidimdən istifadə etmişdir. Bununla bərabər onun bu haqda bir şey deməməsi mənə əsla zərər verməz. Əksinə məni maraqlandıran onun düşdüyü vəziyyəti və xətasıdır. Lakin indi bu məsələnin müfəssəl şəkildə izahına imkan yoxdur.

Nəticə olaraq mövzu ilə bağlı şübhəsi olan kimsə zikr olunan kitaba müraciət edə bilər. Haqqa yönəldən yalnız Allahdır